BEŞİKDƏN QƏBİR EVİNƏDƏK ÖYRƏNİN!
Məhəmməd Peyğəmbər (S.)

# GƏNC MÜƏLLİM

QƏZET 01.02.1958-ci İLDƏN ÇIXIR

Fevral 2018 № 2 (1089)

AZƏRBAYCAN DÖVLƏT PEDAQOJİ UNİVERSİTETİNİN QƏZETİ


## "GƏNC MÜƏLLİM" – 60

## Təhsil müəssisələrində çalışan işçilərin əməkhaqlarının artırılması haqqında

### *Azərbaycan Respublikası Prezidentinin Sərəncamı*



Azərbaycan Respublikası Konstitusiyasının 109-cu maddəsinin 32-ci bəndini rəhbər tutaraq, təhsil müəssisələrində çalışan işçilərin sosial müdafiəsini daha da gücləndirmək və onlara dövlət qayğısını artırmaq məqsədi ilə **qərara alıram:**

1. Dövlət büdcəsindən maliyyələşdirilən təhsil müəssisələrində (ali təhsil müəssisələri istisna olmaqla) çalışan işçilərin aylıq vəzifə maaşları 2018-ci il martın 1-dən orta hesabla 10 faiz artırılsın.

2. Azərbaycan Respublikasının Nazirlər Kabineti bu Sərəncamdan irəli gələn məsələləri həll etsin.

**İlham Əliyev,**
**Azərbaycan Respublikasının Prezidenti**

*Bakı şəhəri, 28 fevral 2018-ci il*

## ADPU həyatının güzgüsü



**Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) İctimaiyyətlə əlaqələr və marketinq şöbəsinin tərkibində fəaliyyət göstərən "Gənc müəllim" qəzetinin nəşrə başlamasının 60 ili tamam oldu.**

1958-ci il fevral ayının 1-dən nəşr olunan qəzetin yaradılmasında başlıca məqsəd bu ali təhsil müəssisəsinin həyatını işıqlandırınaq olmuşdur. İlk nüsxələri jurnalist Xəlil Köçərlinin redaktorluğu ilə nəşr olunan qəzetin səhifələrində bu qabaqcıl elm və təhsil müəssisəsinin həyatı dolğun şəkildə öz əksini tapmış, onun elmi-pedaqoji sahədə qazandığı uğur və nailiyyətlər, həmçinin universitetdə keçirilən ictimai-mədəni tədbirlər müntəzəm olaraq işıqlandırılmışdır. "Gənc müəllim" qəzeti fəaliyyətinin ilk günlərindən gənc nəslin təlim-tərbiyəsi işinin fəal iştirakçısına çevrilmiş, tələbələrin mənəvi-əxlaqi təkamülünə ciddi təsir göstərmişdir.

"Gənc müəllim" qəzeti pedaqoji kadr hazırlığı işində bilavasitə xidmətlər göstərniş, tələbələrin elmi-mədəni səviyyəsinin yüksəldilməsində və dünyagörüşünün genişləndirilməsində mühüm rol oynamışdır. Müxtəlif vaxtlarda qəzetə redaktorluq edən Kamal Qəhrəmanov (1963-1966), Zahid Xəlil (1966-1969), Sərhəd Məmmədov (1969-1972), Zakir Sərdarov (1972-1984), Əziz Axundlu (1984-2000), Təranə Rəhimli (2000-2006), Ayətxan İsgəndərov (2007-2015) universitetin elmi-mədəni nailiyyətlərini "Gənc müəllim"in səhifələrində işıqlandırmaqla yanaşı, tələbələrin yaradıcılığına da xüsusi qayğı ilə yanaşmış, onlarla fəal iş aparmışlar. Tofiq Qəhrəmanov, Akif Səməd, Tofiq Eyvazov, Rabil Novruzov və başqa istedadlı şair və jurnalistlər qəzetin məsul katibi, müxbiri və ədəbi işçisi kimi fəaliyyət göstərmişlər. Yazıları "Gənc müəllim"in səhifələrində müntəzəm olaraq dərc edilən Xəlil Rza Ulutürk, Xeyrəddin Qoca, Məmməd Elli, Tinatin Əliyeva, Əsəd Əsədov, Alqayıt və başqaları qəzetlə sıx əlaqə saxlayan ən fəal müəlliflərdən olmuşlar. Bu tanınmış imzalar qəzetin fəaliyyətinin yüksəldilməsində mühüm rol oynamışlar.

"Gənc müəllim" qəzeti bədii istedadı olan tələbə-gənclərin yaradıcılıq istiqamətlərinin düzgün müəyyənləşdirilməsində də onlara yardımçı olmuşdur.

Son vaxtlar qəzetin nəşri sahəsində bir sıra uğurlar əldə edilmişdir. Qəzetdə dərc edilən materialların jurnalistik, elmi, bədii səviyyəsi xeyli yüksəldilmişdir. Qəzetin səhifələrinin artırılması, tirajın çoxaldılması, tərtibatın yaxşılaşdırılması "Gənc müəllim"in texniki cəhətdən təkmilləşdirilməsinə şərait yaratmışdır. Qəzet universitetin həyatının güzgüsünə, onun tarixini yazan mətbuat orqanına çevrilmişdir.

"Gənc müəllim" qəzeti 2010-cu ilin aprel ayından Azərbaycan Mətbuat Şurasının üzvüdür. Qəzet ADPU-da tədrisin keyfiyyətinin yüksəldilməsi, maddi-texniki bazanın gücləndirilməsi, idarəetmənin optimallaşdırılması, insan resurslarının inkişaf etdirilməsi, beynəlxalq əlaqələrin genişləndirlməsi, qabacıl beynəlxalaq təcrübənin öyrənilməsi və tətbiq edilməsi istiqamətində həyata keçirilən yenilikləri, islahatları geniş və ətraflı işıqlandırır.

Mən bu əlamətdar yubiley münasibətlə qəzetin əməkdaşlarını ürəkdən təbrik edir, möhkəm cansağlığı, müqəddəs, şərəfli və məsuliyyətli peşə fəaliyyətlərində yeni-yeni uğurlar arzulayıram! Yolunuz açıq, məqsədiniz aydın, arzularınız gerçək olsun!

**Cəfər Cəfərov,**
**ADPU-nun rektoru, professor**

## "Pedaqoji kadr hazırlığına sinergetik yanaşma" Respublika elmi-praktik konfransı

**Fevralın 1-də Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) "Pedaqoji kadr hazırlığına sinergetik yanaşma" Respublika elmi-praktik konfransı keçirilib. Konfransda ADPU-nun rəhbərliyi, fakültə dekanları, kafedra müdirləri, professor-müəllim heyəti, Azərbaycan Milli Elmlər Akademiyasının, Təhsil İnstitutunun və ali təhsil müəssisələrinin alim-mütəxəssisləri iştirak ediblər.**

Respublika konfransını giriş sözü ilə açan ADPU-nun Elm və innovasiyalar üzrə prorektoru, fizika-riyaziyyat elmləri doktoru, professor Asəf Zamanov qeyd edib ki, əsası ümummilli lider Heydər Əliyev tərəfindən qoyulmuş, hazırda ölkə Prezidenti möhtərəm İlham Əliyevin rəhbərliyi ilə uğurla həyata keçirilən təhsil islahatlarının əsas məqsədi təhsil sistemimizin dünyanın inkişaf etmiş ölkələrinin təhsil səviyyəsinə uyğunlaşdırılmasıdır. Ölkəmizdə pedaqoji kadr hazırlığına böyük diqqət yetirilir. Hazırda tədqiqat universitetinə çevrilmək istiqamətində işlər həyata keçirilir. Biz ADPU-nun tədqiqat universiteti kimi formalaşması üçün bütün imkanlarımızdan istifadə etməliyik. Bu konfransın keçirilməsi elmi-tədqiqatların həm də sinergetika istiqamətinə yönəldilməsinə xidmət edir. Professor Asəf Zamanov konfransın mahiyyətini və əhəmiyyətini vurğulayaraq sinergetikanın bir elm sahəsi kimi tarixindən söz açıb: canlı və cansız sistemlərin özünütəşkili haqqında elm olaraq sinergetika XX yüzilliyin 70-ci illərindən formalaşmağa başlayıb. Sinergetikanın meydana çıxması fizika və biologiyanın həll etməyə çalışdığı problem ilə əlaqədar idi. Həmin dövrdə fizika iddia edirdi ki, təbiətdə təkamül nizamdan xaosa doğru gedir. Biologiya isə təkamülün xaosdan nizama doğru getdiyini iddia edirdi. Lakin bu iki fikir ayrılığını, aradakı paradoksu sinergetika həll etməyi bacardı. Asəf müəllim sinergetika üzrə formalaşmış alman alimi German Hakenin əsasını qoyduğu Ştutqart məktəbi və kimya üzrə Nobel mükafatçısı Ulya Priqojenin əsasını qoyduğu Brüssel məktəbi, həmçinin rus alimlərindən akademik Aleksandr Samarskinin riyazi modellər və hesablama eksperimenti əsasında yaradılmış özünütəşkil nəzəriyyəsi, akademik Vladimir Arnoldun katastroflar nəzəriyyəsi barədə məlumat verib.

Professor Asəf Zamanov bir sıra tədqiqatçıların elmi nəticələrini əsas götürərək tədris prosesinə sinergetikanın üç istiqamət üzrə daxil edilməsinin məqsədəuyğunluğu (sinergetika təhsil üçün, sinergetika təhsildə və təhsilin sinergetikası), son zamanlar bütün elm sahələrində, o cümlədən sosiologiyada, pedaqogikada sinergetikanın önəmli yer tutması, məhz buna görə də pedaqogikada sinergetika, sinergetik yanaşma anlayışlarından tez-tez istifadə olunmasını diqqətə çəkib. İnteqrativ təlimə xüsusi pedaqoji texnologiyalardan biri olaraq yanaşıldığı kimi artıq sinergetik təlimə də xüsusi pedaqoji texnologiyalardan biri kimi yanaşılmalıdır.




Konfransın plenar iclasında Sosial və humanitar məsələlər üzrə prorektor, professor Fikrət Rzayev, İbtidai təhsil fakültəsinin dekanı, professor Fərrux Rüstəmov, Tarix və coğrafiya fakültəsinin dekanı, dosent Şahin Pənahov çıxış edərək pedaqoji kadr hazırlığına sinergetik yanaşmanı yeni bir yanaşma və metodologiya kimi qiymətləndirərək, onun sağlam təhsil mühitinin formalaşmasına müsbət təsir göstərdiyini vurğulayıblar. Çıxış edənlər bu mövzuda konfransın keçirilməsini yüksək qiymətləndiriblər.

Konfransın plenar iclasında dosent Amaliya Həsənovanın "Bioloji sistemlərin yaranması və təkamülünün sinergetik təhlili" və Günay Nəzərlinin "Pedaqoji sinergetikanın elmi-nəzəri istiqamətləri" mövzusunda məruzələri dinlənilib.

Sonra konfrans öz işini bölmə iclaslarında davam etdirib. Konfransın 3 bölmədə keçirilən iclaslarında ümumilikdə 66 məruzə dinlənilərək müzakirə edilib.

Konfransın sonunda bölmə rəhbərlərinin hesabatları dinlənilib, müvafiq qərar qəbul edilib.

**Mənsur İbrahimli**

# ADPU-da əməkdaşlar işə müsabiqə yolu ilə qəbul edilir

Fevralın 5-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) rektoru, professor Cəfər Cəfərov işə yeni qəbul edilən əməkdaşlarla görüş keçirib. Görüşdə ADPU-nun Tədris işləri üzrə prorektoru, dosent Eldar Aslanov, Elm və innovasiyalar üzrə prorektoru, professor Asəf Zamanov, Tədris Departamentinin direktoru, dosent Sənan Əliyev, Filologiya fakültəsinin dekanı, professor Buludxan Xəlilov, vakant vəzifələrin tutulması üzrə yaradılmış Müsabiqə Komissiyasının üzvləri: İnsan resursları şöbəsinin müdiri Qumral Qədimova, Rəşad Sadıqov, Asəf Kazımov və Razim Məmmədov iştirak ediblər.




Tədbiri giriş sözü ilə açan rektor Cəfər Cəfərov işə yeni qəbul edilən əməkdaşları təbrik edərək onlara uğurlar arzulayıb. Bildirib ki, ADPU böyük tarixə və zəngin ənənələrə malik olan ali təhsil müəssisəsidir. Yaxın gələcəkdə ADPU 100 illik yubileyini qeyd edəcəkdir. Hər bir müəssisədə, o cümlədən ali təhsil müəssisəsində kadr seçimi müstəsna əhəmiyyət kəsb edir. Düzgün kadr seçimi gələcək uğurlara zəmin yaradır. ADPU-da 2017-2018-ci tədris ili üçün müəllim seçimi müsabiqə yolu ilə həyata keçirilib. Müsabiqəyə çıxarılmış 114 vakant yerə 500 nəfər namizəd sənəd verib. Şəffaf və obyektiv keçirilmiş müsabiqə nəticəsində yüksək səviyyəli mütəxəssislər seçilərək onlarla 5 il müddətinə müqavilə bağlanılıb. Bundan başqa, bir müddət əvvəl vakant fakültə dekanları və kafedra müdirlərinin seçilməsi üçün müsabiqə keçirilib. Bu müsabiqə də şəffaf və obyektiv, qanunvericiliyin tələblərinə uyğun keçirilib. Bunlarla yanaşı, universitetdə tədris-köməkçi heyətin, tyutorların, laborantların, baş laborantların da müsabiqə yolu ilə işə qəbul edilməsi gerçəkləşib. Bu metod ali təhsil sistemimizdə ilk dəfə ADPU-da tətbiq edilib. Bu metod daha yaxşı mütəxəssislərin işə qəbul edilməsinə əlverişli şərait yaradır. Bizim əsas vəzifəmiz, başlıca hədəfimiz keyfiyyətli təhsil verməkdir.

Görüşdə İnsan resursları şöbəsinin müdiri Qumral Qədimova çıxış edərək fakültələr üzrə vakant vəzifələrin tutulmasının nəticələri barədə məlumat verib. Bildirib ki, vakant vəzifələrin tutulması üçün Müsabiqə Komissiyası yaradılıb. Müsabiqə barədə mediada müvafiq elan dərc edilib, universitetin saytında yerləşdirilib, bu barədə sosial şəbəkələrdə məlumatlar paylaşılıb. Müsabiqəyə çıxarılan 19 vakant vəzifə üzrə 98 nəfər namizədin sənədi qəbul edilib. Müsabiqə 2 mərhələdə keçirilib. Müsabiqənin 1-ci mərhələsində dekanlıq və kafedralarda namizədlərin bilik və bacarıqları qiymətləndirilib. Komissiyanın keçirdiyi iclaslarda 17 nəfərin sənəd verdiyi vəzifəyə təyin olunması məqsədəuyğun hesab edilib. Onlardan 7 nəfəri ADPU-nun məzunları, 10 nəfəri isə kənardan gələn mütəxəssislərdir.

İşə yeni qəbul edilən əməkdaşlardan Nərmin İsgəndərova, Zəhra Abdullayeva, Gülnur Mehralıyeva, Lalə Zeynalova, Leyla Hümbətova, Nərgiz Ələkbərova, Məlahət Abdullayeva və digərləri çıxış edərək müsabiqənin şəffaf və obyektiv keçirilməsinə, eləcə də gənc mütəxəssislərə göstərdiyi diqqət və qayğıya görə ADPU-nun rəhbərliyinə təşəkkür ediblər.

Görüşə yekun vuran rektor Cəfər Cəfərov işə yeni qəbul edilən əməkdaşlara fəal və təşəbbüskar olmağı, aparıcı xarici dilləri, qabaqcıl beynəlxalq təcrübəni öyrənməyi, bilik və bacarıqlarını universitetin imicinin yüksəldilməsinə yönəltməyi tövsiyə edib.

**Nigar Abbasova**

# ADPU-da Ağsaqqallar Şurası yaradılacaq




**Fevralın 7-də Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) yaşlı müəllim və əməkdaşlarla görüş keçirilib. Görüşün keçirilməsində məqsəd ADPU-da yaradılacaq Ağsaqqallar Şurası ilə bağlı müzakirə aparmaq olub.**

Görüşü giriş sözü ilə açan ADPU-nun rektoru, professor Cəfər Cəfərov bildirib ki, yaşlı nəslin nümayəndələri ilə belə görüşlərin keçirilməsi mühüm əhəmiyyət kəsb edir. Həyatımızda cəmiyyətin bütün təbəqələrinin öz yeri və rolu var. Yaşlı nəslin nümayəndələrinin həyat təcrübəsinə, bilik və bacarığına həmişə ehtiyac duyulur. Eyni zamanda yaşlı nəslə diqqət və qayğı göstərmək olduqca vacibdir. ADPU-da yaşlı müəllim və əməkdaşların təşkilatması qarşımıza qoyduğumuz hədəflərə çatmağımıza səmərəli təsir edə bilər. Buna görə də ADPU-da Ağsaqqallar Şurasının yaradılması məqsədəuyğundur. Ağsaqqallar Şurasında uzun müddət universitetdə layiqincə çalışmış, səmərəli elmi-pedaqoji fəaliyyət göstərmiş, cəmiyyətdə ictimai nüfuza, yüksək mənəvi keyfiyyətlərə malik müəllim və əməkdaşlar təmsil olunacaqlar. Ağsaqqallar Şurasında həm də təqaüdə çıxmış müəllim və əməkdaşlar təmsil olunacaqlar. Yaşlı nəslin təcrübəsi, müdrikliyi gənc nəsil üçün çox önəmlidir. ADPU-nun həyatımızda müstəsna yeri, strateji rolu var. Yüksəkixtisaslı pedaqoji kadrlar hazırlamaq bizim əsas vəzifəmizdir. Bununla yanaşı, biz respublikamızın ictimai-siyasi və mədəni həyatında fəal iştirak etməli, ölkəmizin inkişaf etməsinə, dövlətimizin güclənməsinə öz töhfələrimizi verməliyik. Tələbə-gənclər arasında aparılan tərbiyəvi işlərin miqyasını genişləndirmək vacibdir. Sizin universitetimizin inkişafı, həmçinin ölkə əhəmiyyətli məsələlərə bağlı fikir, təklif, tövsiyə və məsləhətləriniz böyük fayda verə bilər.

Görüşdə çıxış edən professor Vilayət Əliyev, professor Ədalət Fərəcov, professor Nailə Verdizadə, professor Minarə Dadaşova və başqaları Ağsaqqallar Şurasının yaradılmasını müsbət qiymətləndirərək göstərilən diqqət və qayğıya görə ADPU-nun rəhbərliyinə təşəkkür ediblər. Çıxış edənlər Ağsaqqallar Şurasının yaradılması və fəaliyyəti ilə bağlı öz fikir və mülahizələrini bölüşərək Şuranın ADPU-da mənəvi mühitin saflaşdırılmasına, həyata keçirilən quruculuq işlərinə, islahatlara, yeniliklərə dəstək verəcəklərini vurğulayıblar.

Görüşdə Ağsaqqallar Şurasının yaradılması ilə bağlı tərkibinə təcrübəli və nüfuzlu müəllim-alimlərin daxil edildiyi İşçi qrup yaradılıb.

Görüşə yekun vuran rektor Cəfər Cəfərov yaşlı müəllim və əməkdaşlara vicdanlı və səmərəli fəaliyyətlərinə görə təşəkkür edib, onlara öz xoş arzularını bildirib.

**Orxan Abdullayev**

# “İrəvanda milli maarifçilik mühiti” kitabının təqdimatı

Fevralın 9-da Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) filologiya üzrə elmlər doktoru, professor Cəfər Cəfərovun və filologiya üzrə fəlsəfə doktoru, dosent Cəlal Allahverdiyevin müəllifi olduqları “İrəvanda milli maarifçilik mühiti” kitabının təqdimatı keçirilib. Tədbirdə ADPU-nun rəhbərliyi, fakültə dekanları, kafedra müdirləri, müəllimləri, əməkdaşları, tanınmış alimlər, ziyalılar iştirak ediblər. Kitabın elmi redaktorları filologiya üzrə elmlər doktoru, professor Buludxan Xəlilov, tarix üzrə fəlsəfə doktoru, Dövlət mükafatı laureatı Nazim Mustafa, rəyçilər pedaqogika üzrə elmlər doktoru, professor Əjdər Ağayev, pedaqogika üzrə elmlər doktoru, professor Rüfət Hüseynzadə, filologiya üzrə elmlər doktoru, professor Mahirə Nağıqızı, pedaqogika üzrə elmlər doktoru Həsən Bayramoğludur.



Tədbiri giriş sözü ilə açan ADPU-nun rektoru, professor Cəfər Cəfərov bildirib ki, Yeni Azərbaycan Partiyasının (YAP) fevralın 8-də keçirilən VI qurultayında partiyanın Sədri İlham Əliyevin prezidentliyə namizədliyi irəli sürüldü. Dövlət başçımız ölkənin gələcək inkişaf strategiyası ilə bağlı geniş və məzmunlu çıxış etdi, qarşıda duran əsas vəzifə və başlıca hədəfləri açıqladı. Cənab Prezident xüsusi qeyd etdi ki, biz tarixi torpaqlarımıza qayıtmalıyıq. Elm adamlarımız, düşüncə sahiblərimiz, ziyalılarımız tariximizi yaşatmalı, gələcək nəsillərə ötürməlidir. Bu gün təqdimatına yığışdığımız “İrəvanda milli maarifçilik



mühiti” kitabı bu baxımdan mühüm əhəmiyyət kəsb edir. Elmi-tarixi faktlara əsaslanan bu kitab maarifpərvər ziyalılarımızın həyat və fəaliyyətinin öyrənilməsi, tədqiq olunması baxımından təqdirəlayiqdir. İrəvan maarifçilik mühitinin təmsilçiləri xalqımızın mənəvi təkamülündə, ölkəmizin mədəni inkişafında sanballı xidmətlər göstəriblər. Rektor çıxışının sonunda kitabın müəlliflərinə təşəkkür edib və onlara uğurlar arzulayıb.

Tədbirdə çıxış edən professor Buludxan Xəlilov “İrəvanda milli maarifçilik mühiti” kitabının təqdimatının ADPU-da keçirilməsini təbii bir hal kimi qiymətləndirib. Qeyd edib ki, ADPU ölkəmizdə ali pedaqoji təhsilin öncülü hesab edilir. Bu kitab təhsil tariximizin ardıcıl tədqiqi baxımından böyük önəm kəsb edir və təhsilimiz üçün layiqli töhfədir. İrəvan təhsil mühiti Azərbaycan təhsilinin bir parçasıdır, bir qoludur. Bu baxımdan, “İrəvanda milli maarifçilik mühiti” kitabı yeni axtarışlara, araşdırmalara, elmi-tədqiqatlara istiqamət verir. İrəvan təhsil mühitinin yetirmələrinin bir çoxu ADPU-da çalışaraq universitetimizin inkişafında mühüm rol oynayıblar.

Pedaqogika üzrə elmlər doktoru, professor Rüfət Hüseynzadə, Bakı Dövlət Universitetinin (BDU) professorları Əyyub Əzizov, Cəlil Nağıyev, Azərbaycan Milli Elmlər Akademiyasının (AMEA) müxbir üzvü, professor Vəli Əliyev, tarix üzrə fəlsəfə doktoru Nazim Mustafa, Əməkdar elm xadimi, professor Fərrux Rüstəmov, Bakı Slavyan Universitetinin (BSU) professoru Şəlalə Həsənova, Əməkdar müəllim, şair Oqtay Rza, Azərbaycanda Atatürk Mərkəzinin şöbə müdiri Nazir Əhmədli və başqaları çıxış edərək hərtərəfli elmi araşdırmalar,böyük əmək, fədakarlıq, milli təəssübkeşlik, vətənpərvərlik sayəsində ərsəyə gələn “İrəvanda milli maarifçilik mühiti” kitabını yüksək qiymətləndirərək müəlliflərə uğurlar arzulayıblar.

Qeyd edək ki, kitabdan Azərbaycanın təhsil tarixi ilə maraqlananlar, magistrlər, tədqiqatçılar, geniş oxucu kütləsi istifadə edə bilər.

Kitabın müəllifləri professor Cəfər Cəfərov və dosent Cəlal Allahverdiyev çıxış edərək təqdimat mərasiminin keçirilməsinə görə ADPU-nun rəhbərliyinə təşəkkür ediblər.

Sonda xatirə şəkli çəkdirilib.

**Mahirə Mustafayeva**

# II və III tədris ili magistrantlarının elmi-pedaqoji təcrübəsinin başlanmasına həsr olunmuş konfrans

**Fevralın 14-də Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) II və III tədris ili magistrantlarının elmi-pedaqoji təcrübəsinin başlanmasına həsr olunmuş konfrans keçirilib.**

ADPU-nun rektoru, professor Cəfər Cəfərov konfransı giriş sözü ilə açaraq bildirib ki, universitetin cəmiyyət və dövlət qarşısında böyük öhdəliyi var. Biz Azərbaycan məktəbləri üçün yüksək səviyyəli pedaqoji kadrlar hazırlamalıyıq. Bu, həm də ADPU-nun şərəfli missiyasıdır. Ulu öndər Heydər Əliyev demişdir: "Mən Yer üzündə müəllimdən yüksək ad tanımıram". Elmi-pedaqoji təcrübə magistrantların həyatında mühüm və məsuliyyətli bir mərhələdir. Siz öyrəndiyiniz bilik və bacarıqları





təcrübədə tətbiq edəcəksiniz. İstər təhsil dövründə, istərsə də sonrakı fəaliyyətinizdə ADPU-nun adını uca tutmalı, böyük və şərəfli ənənələri yaşatmalısınız. Rektor çıxışının sonunda magistrantlara uğurlar arzulayıb.

Elm və innovasiyalar üzrə prorektor, professor Asəf Zamanov çıxış edərək bildirib ki, elmi-pedaqoji təcrübə magistrantlar üçün çox vacibdir. Elmi-pedaqoji təcrübə müddətində nizam-intizam və keyfiyyət təmin edilməlidir. Elmi-tədqiqat fəaliyyəti magistrantlar üçün mühüm əhəmiyyət kəsb edir. Biz elmi rəhbər məsələsinə xüsusi diqqət yetirməliyik. Magistr dissertasiyalarının keyfiyyəti yüksəldilməli, plagiatlığa yol verilməməlidir. Magistrantlarımız dünyanın aparıcı dillərini, xüsusilə də, ingilis dilini mükəmməl öyrənməlidirlər. Biz ADPU-nun tədqiqat universitetinə çevrilməsi üçün birgə əzmlə çalışmalıyıq. Yaxın vaxtlarda ADPU-da "Fənlərin tədrisi metodikası:müasir yanaşma" Respublika elmi konfransı keçiriləcək. Magistrantlarımız bu elmi konfransda fəal iştirak etməlidirlər.

Magistratura və doktorantura şöbəsinin müdiri, professor İbrahim Bayramov elmi-pedaqoji təcrübənin təşkili və keçirilməsi haqqında məlumat verib. Qeyd edib ki, ADPU-da əyani formada təhsil alan II və III tədris ili magistrantları 16 fevral - 16 mart tarixlərində ixtisas kafedralarında 4 həftə elmi-pedaqoji təcrübə keçəcəklər. Elmi-pedaqoji təcrübədə 19 ixtisas, 20 ixtisaslaşma üzrə 415 nəfər magistrant iştirak edəcək.

Konfransda elmi-pedaqoji təcrübənin səmərəli təşkili və keyfiyyətinin yüksəldilməsi ilə bağlı fikir mübadiləsi aparılıb, maraqlı təkliflər irəli sürülüb.

# Finlandiya-Azərbaycan Assosiasiyasının vitse-prezidenti Arzu Oqtayla görüş

Fevralın 14-də Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) təhsil işçisi, Finlandiya-Azərbaycan Assosiasiyasının vitse-prezidenti Arzu Oqtayla görüş keçirilib. Qeyd edək ki, görüş ADPU-nun Tədris Departamentinin direktoru, dosent Sənan Əliyevin, Məzun, Koordinasiya və Karyera Mərkəzinin müdiri Könül Əsgərovanın təşəbbüs və təşkilatçılığı ilə keçirilib. Görüşdə ADPU-nun rəhbərliyi, fakültə dekanları, kafedra müdirləri iştirak ediblər.




Görüşü giriş sözü ilə açan ADPU-nun rektoru, professor Cəfər Cəfərov Arzu Oqtayın həyat və fəaliyyəti barədə məlumat verib. Bildirib ki, Arzu Oqtay qızı Muradlı Bakı şəhərində anadan olub. 1991-cu ildə Bakı Dövlət Universitetini bitirib. 2002-ci ildən Finlandiyada yaşayır. Pedaqoji fəaliyyətini davam etdirir. Eyni zamanda diaspor quruculuğunda fəal iştirak edir. Finlandiyada ölkəmizi təbliğ edir, Azərbaycan həqiqətlərinin dünya ictimaiyyətinə çatdırılması üçün əzmlə çalışır. Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyevin müvafiq sərəncamı ilə diaspor quruculuğundakı səmərəli fəaliyyətinə görə "Tərəqqi" medalına və Diasporla İş üzrə Dövlət Komitəsinin fəxri fərmanına layiq görülüb. Görüşün keçirilməsində məqsəd Arzu Oqtayın təqdimatında Finlandiyanın təhsil sistemi haqqında məlumat almaqdır. Finlandiya təhsil sistemi dünyada uğurlu təhsil modeli kimi qəbul edilir. Bu görüşün keçirilməsi qabaqcıl beynəlxalq təcrübənin öyrənilməsi və fikir mübadiləsi baxımından mühüm əhəmiyyət kəsb edir. Rektor qeyd edib ki, ADPU-da Pedaqoji Forum fəaliyyətə başlayır. Bu forumda həm ADPU-nun alim-mütəxəssisləri, həm də respublikamızın tanınmış və nüfuzlu təhsil ekspertləri təqdimatlarla çıxış edəcəklər. Bununla yanaşı, Filologiya, Tarix və coğrafiya fakültələrində tariximiz, ədəbiyyatımız, milli mədəniyyətimizlə bağlı müxtəlif tədbirlərin keçirilməsi nəzərdə tutulur. Biz pedaqoji təhsildə qabaqcıl beynəlxalq təcrübəni öyrənməli, tətbiq etməli, təhsilin keyfiyyətini yüksəltməliyik. ADPU 100 illik yubileyini layiqli nəticələrlə yüksək səviyyədə qeyd etməlidir.

Arzu Oqtay öncə görüşün keçirilməsinə görə ADPU-nun rəhbərliyinə təşəkkür edib və universitetin kollektivinə uğurlar arzulayıb. Təqdimatında Finlandiyanın təhsil sistemi haqqında məlumat verərək qeyd edib ki, Finlandiyanın təhsil sistemi sadə, lakin mütərəqqi bir sistemdir. Finlandiyanın təhsil sistemi rəqabətə yox, həmrəylik prinsipinə əsaslanır. Bu təhsil sistemi şagirdlərin yüklənməsinə yol vermir. Müəllim Finlandiya cəmiyyətində ən yüksək statusa malikdir. Müəllim tədrisdə şagirdlərin sərbəst axtarışlar etmələrinə şərait yaradır. Məktəbin öz büdcəsi olur. Şagirdlərin peşə-ixtisas seçimi düzgün istiqamətləndirilir. Finlandiyada repetitorluq fəaliyyəti yoxdur. Universitetlərdə müəllimlər tələbələrlə öz həmkarları kimi davranırlar. Finlandiya Avropa ölkələri arasında yeganə dövlətdir ki, burada azsaylı xalqların ana dili tədris edilir.

Tədbirdə iştirakçıların sualları cavablandırılıb, maraqlı və səmərəli fikir mübadiləsi aparılıb. Görüşdə professor Fikrət Rzayev, professor Müseyib İlyasov, professor Fərrux Rüstəmov, dosent Şahin Pənahov, dosent Yusif Alıyev, dosent Əli Zalov, dosent Oqtay Alxasov və başqaları çıxış edərək cəmiyyətdə müəllimin yeri və mövqeyi, ictimai nüfuzu barədə öz fikir və mülahizələrini bölüşüblər.

Görüşə yekun vuran rektor Cəfər Cəfərov belə görüşlərin davamlı keçirilməsinin vacibliyini vurğulayaraq maraqlı və məzmunlu təqdimata görə Arzu Oqtaya təşəkkür edib.

**Könül Nəzərova**

# Əyani təhsilalma forması üzrə tələbələrin pedaqoji təcrübəsinin başlanmasına həsr olunmuş konfrans

Fevralın 16-da Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) əyani təhsilalma forması üzrə tələbələrinin pedaqoji təcrübəsinin başlanmasına həsr olunmuş konfrans keçirilib. Konfransda ADPU-nun rektoru, professor Cəfər Cəfərov, Tədris işləri üzrə prorektoru, dosent Eldar Aslanov, Bakı Şəhəri üzrə Təhsil İdarəsinin müdiri Məhəbbət Vəliyeva, universitetin Pedaqoji Təcrübə üzrə Komissiyasının üzvləri, dekanlar, metodistlər, orta məktəblərin direktorları və pedaqoji təşrübə keçəcək tələbələr iştirak ediblər. Konfrans Azərbaycan Respublikasının Dövlət Himninin səsləndirilməsi ilə başlayıb.



Konfransı giriş sözü ilə açan Tədris işləri üzrə prorektor, dosent Eldar Aslanov bildirib ki, ölkəmizdə uğurla həyata keçirilən təhsil islahatları davam etdirilir. ADPU bu islahatların həyata keçirilməsində fəal iştirak edir. Universitetin əyani təhsilalma forması üzrə tələbələrinin pedaqoji təcrübəsi haqqında məlumat verən dosent E.Aslanov qeyd edib ki, tələbələr 14 həftəlik pedaqoji təcrübə keçməlidirlər. 1885 nəfər tələbə pedaqoji təcrübəyə yollanır. Onlar Təhsil Nazirliyinin tabeliyindəki 3 və Bakı Şəhəri üzrə Təhsil İdarəsinin tabeliyindəki 62 tam orta məktəbə, Bakı Şəhər İcra Hakimiyyətinin tabeliyindəki 9 məktəbəqədər tərbiyə müəssisəsində və 6 özəl müəssisədə pedaqoji təcrübə keçəcəklər. Pedaqoji təcrübə 8 fakültə üzrə 23 ixtisası əhatə edir. ADPU-nun filiallarının isə 582 nəfər tələbəsi pedaqoji təcrübə keçəcək. Ümumilikdə 2467 nəfər tələbə pedaqoji təcrübədə iştirak edəcək.



ADPU-nun rektoru, professor Cəfər Cəfərov çıxış edərək bildirib ki, pedaqoji təcrübə ali məktəb tələbələrinin həyatında mühüm və məsuliyyətli bir mərhələdir. Müasir tələblərə uyğun olaraq pedaqoji təhsilə, o cümlədən pedaqoji təcrübəyə münasibət dəyişməli, yeni, fərqli yanaşmalar ortaya qoyulmalıdır. Son illər Azərbaycanda müəllimlərin bilik və peşəkarlıq səviyyəsinin artırılması, cəmiyyətdə müəllimin ictimai nüfuzunun yüksəldilməsi üçün mühüm tədbirlər həyata keçirilir. Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyev pedaqoji kadr hazırlığına xüsusi diqqət və qayğı göstərir. Biz ölkə rəhbərliyinin bu diqqət və qayğısına öz əməli fəaliyyətimizlə cavab verməli, orta məktəblərimizi yüksək səviyyəli pedaqoji kadrlarla təmin etməliyik. Rektor çıxışının sonunda pedaqoji təcrübə keçəcək tələbə-gənclərə uğurlar arzulayıb.

Bakı Şəhəri üzrə Təhsil İdarəsinin müdiri Məhəbbət Vəliyeva çıxışında ADPU-da təhsilin keyfiyyətinin yüksəldilməsi üçün həyata keçirilən yenilikləri, islahatları, layihələri xüsusi vurğulayıb, tələbələrə sağlam düşüncəli, milli ruhlu, vətənpərvər vətəndaş və yüksək səviyyəli mütəxəssis kimi formalaşmağı tövsiyə edib.

Filologiya fakültəsinin dekanı, professor Buludxan Xəlilov, İbtidai təhsil fakültəsinin dekanı, professor Fərrux Rüstəmov, Bakı şəhəri, Nərimanov rayonu 193 nömrəli tam orta məktəbin direktoru, dosent Rəhim Hüseynov, 45 nömrəli tam orta məktəbin direktoru Nəcibə Axundova çıxış edərək pedaqoji təcrübənin tələbələrin əldə etdikləri bilik və bacarıqların aşkara çıxarılmasında mühüm rol oynadığını bildiriblər və tələbələrə uğurlar arzulayıblar.

**Mahirə Məhərrəmqızı**

# ADPU ilə Girne Amerikan Universiteti arasında əməkdaşlıq məsələləri müzakirə edilib

**Fevralın 19-da Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) rektoru, professor Cəfər Cəfərov Şimali Kipr Türk Respublikasının Girne Amerikan Universitetinin təsisçisi və qurucusu, rektoru, professor Serhat Akpınar və prorektoru, professor Sualp Davutla görüşüb. Görüşdə Tədris işləri üzrə prorektor, dosent Eldar Aslanov, Tədris Departamentinin direktoru, dosent Sənan Əliyev, Beynəlxalq əlaqələr şöbəsinin mütəxəssisi Lətif Kəngərli, Proloq İnkişaf Mərkəzinin təsisçisi Orxan Həsənoğlu iştirak ediblər.**



Qonaqları rəhbərlik etdiyi ADPU-da görməkdən məmnunluq duyduğunu bildirən rektor Cəfər Cəfərov onlara universitetin tarixi, müasir vəziyyəti, tədris prosesi, həyata keçirilən islahatlar, yeniliklər barədə məlumat verib. Rektor qeyd edib ki, Azərbaycan Müəllimlər İnstitutunun ADPU-ya qoşulmasından sonra universitet struktur və müəllim-tələbə heyəti baxımından ölkəmizin ən böyük universitetlərindən birinə çevrilib. Hazırda ADPU-da 8 fakültə, 35 kafedra fəaliyyət göstərir. ADPU-nun 5 filialı var. Azərbaycan Dövlət Pedaqoji Kolleci ADPU-nun nəzdində fəaliyyət göstərir. Məmməd Rahim adına 7 nömrəli tam orta məktəb ADPU-nun baza məktəbi müəyyən edilib. ADPU-da 17 mindən çox tələbə təhsil alır. Tədris 4 binada aparılır. ADPU-da həyata keçirilən islahatların, yeniliklərin, layihələrin əsas məqsədi müəllim hazırlığının keyfiyyətinin yüksəldilməsi, ölkəmizin məktəblərini yüksəkixtisaslı pedaqoji kadrlarla təmin etməkdir. ADPU beynəlxalq əlaqələrinin genişləndirilməsinə və qabaqcıl dünya təcrübəsinin öyrənilməsinə böyük önəm verir. ADPU Avropanın, Türkiyənin, Şimali Kipr Türk Respublikasının və digər ölkələrin universitetləri ilə əməkdaşlıq əlaqələrinin qurulması üçün səmərəli əməli fəaliyyət gerçəkləşdirir. ADPU-da TÜRKSOY kafedrası, Türk araşdırmaları və Dədə Qorqud elmi-tədqiqat laboratoriyaları fəaliyyət göstərir.

Girne Amerikan Universitetinin təsisçisi və qurucusu, rektoru Serhat Akpınar səmimi və qonaqpərvər münasibətə görə ADPU-nun rəhbərliyinə təşəkkür edib. Təmsil etdiyi universitet haqqında danışan professor Serhat Akpınar universitetin fakültələri, ixtisasları, tədris prosesi, beynəlxalq əlaqələri barədə ətraflı məlumat verib.

Görüşdə ADPU ilə Girne Amerikan Universiteti arasında müəllim-tələbə mübadiləsi, birgə elmi-tədqiqat işlərinin aparılması, layihə və proqramların icra edilməsi, müştərək beynəlxalq elmi konfransların, simpozium, sərgi və seminarların keçirilməsi, eləcə də dil-ədəbiyyat sahəsində və digər sahələrdə əməkdaşlıq məsələləri müzakirə edilib.

Görüşdə hədiyyələr təqdim edilib. Sonra rektor Cəfər Cəfərov qonaqları universitetin tədris binası ilə tanış edib. Sonda xatirə şəkli çəkdirilib.

**Orxan Fəxrəddinoğlu**

# ADPU-da təhsil almaq istəyən əcnəbi vətəndaşların müsahibəsi

Fevralın 14-də Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) Nazirlər Kabinetinin 1 may 2015-ci il tarixli 125 nömrəli qərarı ilə təsdiq edilmiş "Azərbaycan Respublikasının vətəndaşlarının xarici ölkələrdə, əcnəbilərin və vətəndaşlığı olmayan şəxslərin Azərbaycan Respublikasında təhsil alması Qaydaları"na və Təhsil Nazirliyinin 29 dekabr 2017-ci il tarixli 05-12-6074/15 nömrəli məktubuna əsasən ADPU-nun hazırlıq səviyyəsinə fərdi qaydada daxil olmaq üçün müraciət edən əcnəbi vətəndaşların dil və ümumi biliklərini dəyərləndirmək məqsədilə yaradılmış Müsahibə Komissiyasının iclası keçirilib.

Müsahibə Komissiyasının iclasında 2017-2018-ci tədris ilinin yaz semestrindən etibarən ADPU-da ali təhsilin magistratura səviyyəsinin "İbtidai sinif müəllimliyi" ixtisası üzrə dil hazırlığına qəbul olunmaq istəyən Türkiyə Respublikasının vətəndaşları iştirak ediblər.

Müsahibə Komissiyasının sədri, ADPU-nun rektoru, professor Cəfər Cəfərov çıxış edərək namizədlərə uğurlar arzulayıb. İclasda komissiyanın sədr müavini, Beynəlxalq əlaqələr üzrə prorektor Nigar Abbaszadə və komissiyanın üzvləri- Tədris işləri üzrə prorektor, dosent Eldar Aslanov, Elm və innovasiyalar üzrə prorektor, professor Asəf Zamanov, Sosial və humanitar məsələlər üzrə prorektor, professor Fikrət Rzayev,Ümumi işlər üzrə prorektor Əbdül Xalıqov, Tədris departamentinin direktoru, dosent Sənan Əliyev, Magistratura və doktorantura şöbəsinin müdiri, professor İbrahim Bayramov, İbtidai təhsil fakültəsinin dekanı, professor Fərrux Rüstəmov, Məktəbəqədər təhsil, psixoloji xidmət və korreksiyaedici təlim fakültəsinin dekanı, pedaqogika üzrə elmlər doktoru Şəhla Əliyeva, Əcnəbi tələbələrlə iş şöbəsinin müdiri Aynurə Əsgərova, Tələbələrin qeydiyyatı və dövlət nümunəli sənədlərlə iş şöbəsinin müdiri Vüsal Xəlilov, Tədqiqat və inkişaf şöbəsinin müdiri Şəhla Əhmədova, iclasın katibi, Beynəlxalq əlaqələr şöbəsinin mütəxəssisi Vəfa Abbasova iştirak ediblər. Komissiya üzvləri namizədlərin hər birini dinləyərək, sual-cavab aparıblar. Müsahibədə iştirak edən əcnəbi vətəndaşların universitetin magistratura səviyyəsi üzrə dil hazırlığına qəbul olunmaları məqsədəuyğun hesab edilib.

Qeyd edək ki, ADPU-nun müvafiq ixtisasları üzrə dil hazırlığına qəbul olunmaq istəyən əcnəbi vətəndaşlar üçün aparılan bu müsahibə yaz semestrində ilk dəfə olaraq həyata keçirilib. Bir semestr (20 həftə, 600 saat) müddətində nəzərdə tutulan tədris prosesinin təşkili üçün Əcnəbi tələbələrlə iş şöbəsinin yeni İşçi-Tədris Planı tərtib edilib, yeni proqramların hazırlanması üçün universitet rəhbərliyi tərəfindən kafedralara tapşırıq verilib. İnanırıq ki, ilk dəfə həyata keçirilən bu təcrübə ADPU-da təhsil almaq istəyən əcnəbi tələbələrin cəlb edilməsi istiqamətində faydalı olacaqdır.

# Professor Tamuris Əliyevanın 90 illik yubileyinə həsr edilmiş xatirə gecəsi

**Fevralın 22-də Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) görkəmli pedaqoq-alim, pedaqoji elmlər doktoru, professor Tamuris Nağı qızı Əliyevanın 90 illik yubileyinə həsr edilmiş xatirə gecəsi keçirilib. Tədbirdə ADPU-nun rəhbərliyi, fakültə dekanları, kafedra müdirləri, müəllim və tələbələr iştirak ediblər. Qeyd edək ki, tədbirdə professor Tamuris Əliyevanın oğlu Pərviz İsmayılzadə, qızları Nuridə İsmayılzadə və Nahidə İsmayılzadə iştirak ediblər.**




Tədbiri giriş sözü ilə açan Filologiya fakültəsinin dekanı, professor Buludxan Xəlilov bildirib ki, Tamuris Əliyeva 1928-ci ildə Bakı şəhərində anadan olub. Tamuris Əliyeva məşhur Bakı milyonçusu, xeyriyyəçi İsabəy Hacınskinin nəvəsidir. Eyni vaxta həm Bakı Dövlət Universitetində, həm də Azərbaycan Dillər Universitetində ali təhsil alıb. Fars dilini, rus dilini, Avropa dillərini yaxşı bilib. 1956 -cı ildə aspiranturaya qəbul olunub. 1961-cı ildə «Azərbaycan məktəblərinin ibtidai siniflərində rus tələffüzünün düzgün təkmillişdirilməsinin metodikası» mövzusunda namizədlik dissertasiyasını uğurla müdafiə edib.

1966-cı ildən taleyini Azərbaycan Dövlət Pedaqoji İnstitutu (indiki ADPU) ilə bağlayıb. Professor Tamuris Əliyeva1966-2007-ci illərdə ADPU-nun Rus dili kafedrasının müdiri işləyib. ADPU-da rus dilinin tədrisi sahəsində səmərəli fəaliyyət göstərib. Onun rəhbərlik etdiyi kafedra aparıcı kafedra olduğu üçün burada 30-dan çox namizədlik dissertasiyası müdafiə olunub. Tamuris Əliyeva 100-dən artıq məqalənin müəllifidir. O, respublika, zona, ittifaq və beynəlxalq səviyyəli konfranslarda dəfələrlə məruzələrlə çıxış edib. Tamuris Əliyevanın tədqiqatlarının əsas mövzusu orta və ali məktəblərin Azərbaycan bölmələrində rus dilinin tədrisinin təkmilləşdirilməsinin metodikası idi. 1985-ci ildə Moskvada "Azərbaycan məktəbində rus tələffüzünün sistemli şəkildə linqvodidaktik əsaslarının qurulması" mövzusunda doktorluq dissertasiyasını müdafiə edib. 1986-cı ildə Tamuris Əliyevaya professor elmi adı verilib. Onun elmi rəhbərliyi ilə respublikamızın orta və ali məktəb müəllimləri 20-dən çox namizədlik dissertasiyası müdafiə ediblər. Tamuris Əliyeva namizədlik və doktorluq dissertasiyalarının müdafiəsi zamanı opponent olaraq çıxış edib. Tbilisidə, Moskvada müdafiə olunan namizədlik və doktorluq dissertasiyalarına rəy verib. Sakit, təmkinli, müdrik, həssas, yüksək mənəviyyatlı, xeyirxah, nəcib, eyni zamanda cəsarətli, prinsipial, sözübütöv insan olub. Həyat yoldaşı Cəfər İsmayılzadə neft-qaz sənayesi sahəsində çalışıb. Onlar övladlarını cəmiyyət üçün layiqli vətəndaş kimi yetişdiriblər. Tamuris Əliyeva 2008-ci il fevralın 4-də vəfat edib.



ADPU-nun rektoru, professor Cəfər Cəfərov çıxışında bildirib ki, 100 ilə yaxın tarixi olan universitet böyük alimlər, ziyalılar, mütəfəkkirlər, ictimai-siyasi xadimlər yetisdirib. Azərbaycan Milli Elmlər Akademiyasının (AMEA) 10 prezidentindən 3-ü-Yusif Məmmədəliyev, Həsən Abdullayev, Zahid Xəlilov ADPU-nun məzunlarıdır. Biz ADPU-da bu böyük alimlərin adına auditoriyaların yaradılmasını, onların yubileyləri münasibətilə konfransların və digər tədbirlərin keçirilməsini planlaşdırırıq. ADPU-nun və bütövlükdə ölkəmizin inkişafında mühüm rol oynamış böyük, işıqlı insanlarının xatirəsinin hörmətlə anılması, onların həyat və fəaliyyətinin öyrənilməsi, gənc nəslə çatdırılması bizim müqəddəs mənəvi borcumuzdur. Bu baxımdan professor Tamuris Əliyevanın 90 illik yubileyinə həsr edilmiş tədbirin keçirilməsi diqqətəlayiqdir. Rektor çıxışının sonunda tədbirin ərsəyə gəlməsində əməyi olan hər kəsə təşəkkür edib.

Tədbirdə professor Fikrət Rzayev, professor Himalay Qasımov, professor Zahid Xəlil, professor Nailə Verdizadə, filologiya üzrə elmlər doktoru Leyla Vəzirova çıxış edərək professor Tamuris Əliyevanı tanınmış və tələbkar pedaqoq-alim, əsl ziyalı qadın kimi səciyyələndiriblər. Çıxışlarda qeyd edilib ki, belə insanların yada salınması, xatırlanması bir qədirbilənlik nümunəsi olmaqla yanaşı, ADPU-nun cəmiyyətdəki nüfuzunun artmasına, imicinin yüksəlməsinə müsbət təsir edir.

Professor Tamuris Əliyevanın qızı, Üzeyir Hacıbəyli adına Bakı Musiqi Akademiyasının elmi laboratoriyasının müdiri, sənətşünaslıq üzrə fəlsəfə doktoru, dosent Nuridə İsmayılzadə çıxış edərək tədbirin keçirilməsinə görə ADPU-nun rəhbərliyinə təşəkkür edib və anası ilə bağlı xatirələrini bölüşüb.

**Nurlan Səmədov**

# ADPU-nun Pedaqoji Forumunun "Təhsil strategiyasının əsas dayağı: səriştə əsaslı təhsil" mövzusunda dinləməsi

**Fevralın 21-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) yeni fəaliyyətə başlayan Pedaqoji Forumunun (PF) ilk tədbiri keçirilib. Tədbirdə tanınmış və nüfuzlu təhsil eksperti Asif Cahangirovun"Təhsil strategiyasının əsas dayağı: səriştə əsaslı təhsil" mövzusunda təqdimatı dinlənilib. Tədbirdə ADPU-nun rəhbərliyi, fakültə dekanları, kafedra müdirləri, şöbə müdirləri, professor-müəllimlər, tələbələr, təhsil ekspertləri, qeyri-hökumət təşkilatlarının təmsilçiləri və kütləvi informasiya vasitələrinin əməkdaşları iştirak ediblər.**

ADPU-nun Tədris işləri üzrə prorektoru, dosent Eldar Aslanov PF haqqında məlumat verərək bildirib ki, PF ölkədə elmi-pedaqoji müzakirələrin keçirildiyi daimi platformadır. PF hər ilin sentyabr-may aylarında ölkədə və xaricidə təhsil və pedaqoji fikir sahəsində böyük təcrübəyə, elmi-tədqiqat nəticələrinə malik alimlərin və ekspertlərin dinləmələrinin keçirilməsi üçün imkandır. PF-un dinləmələrinin ayda bir dəfə keçirilməsi planlaşdırılır. PF qeyri-kommersiya, qeyri-formal düşüncə platformasıdır. PF ölkədə pedaqoji təhsil sahəsində mövcud dövlət, özəl və qeyri-hökumət təşkilatlarının bu platformada iştirakında maraqlıdır.

Çıxışında həm də məruzəçi haqqında danışan dosent E.Aslanov qeyd edib ki,

Asif Cahangirovun təhsil menecmenti sahəsində 40 ilə yaxın iş təcrübəsi vardır. O, müasir idarəetmə üzrə zəruri bilik və kompetensiyalara malikdir. İdarəetmənin demokratikləşdirilməsi və əksmərkəzləşdirilməsi, səlahiyyətlərin bölüşdürülməsi, əmək fəaliyyətinin qiymətləndirilməsi, xüsusilə, "Hədəfyönümlü idarəetmə" və "Nəticəyönümlü idarəetmə" üzrə beynəlxalq təcrübəni dərindən öyrənmiş və uğurla tətbiq etmişdir. Rəhbər və pedaqoji kadrların seçilib yerləşdirilməsi, ixtisaslarının artırılması, tabeliyində olan əməkdaşların iş keyfiyyətinin düzgün qiymətləndirilməsi, əməyin rəğbətləndirilməsi və digər məsələlər daim onun diqqət mərkəzində olmuşdur. A.Cahangirov bir çox ölkələrin



təhsil sahəsində qanunvericilik bazasının təhlilini aparmış, "Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası"nın hazırlanmasında fəal iştirak etmişdir. Məqsədli təlim səfərləri zamanı Asif müəllim 21 ölkədə keçirilmiş treninq və seminarlarda təhsilin bütün sahələri üzrə beynəlxalq təcrübəni yerində mənimsəmiş, 50-dən çox ölkənin təhsil sistemini ətraflı öyrənmişdir. Ölkə və regional səviyyədə məktəbəqədər, ümumi orta, peşə-ixtisas, əlavə təhsilin təşkili və idarəolunması, təhsilin strategiyası, səmərəliliyi və keyfiyyətin idarəolunması, tədris və təlim prosesləri, kurikulum, dərslik, müəllim hazırlığı, təhsilin maliyyələşdirilməsi və infrastrukturu, təhsildə fundamental və tətbiqi tədqiqatlar, təhsil sistemində monitorinq, qiymətləndirmə və hesabatvermə sahələri üzrə müasir bilik və səriştələr əldə etmişdir. A.Cahangirov bir sıra beynəlxalq və ölkəmiqyaslı konfrans, seminar və treninqlər təşkil etmiş, onların moderatoru olmuşdur. Təcrübəli pedaqoqun Bolonya prosesi, tələbələrin təlim fəaliyyətinin kredit sistemi əsasında qiymətləndirilməsi, əmək fəaliyyətinin qiymətləndirilməsi, müasir təlim, komandadaxili fəaliyyət, səriştə əsaslı təhsil və s. aktual mövzularda təqdimatları pedaqoji ictimaiyyət və tələbələr arasında böyük əks-



səda yaratmışdır. Onun fəaliyyəti ölkə rəhbərliyi tərəfindən layiqincə qiymətləndirilib. "Əməkdar müəllim" fəxri adına layiq görülüb, "Tərəqqi" medalı ilə təltif edilib.

"Təhsil strategiyasının əsas dayağı: səriştə əsaslı təhsil" mövzusunda təqdimatla çıxış edən təhsil eksperti A.Cahangirov öncə təqdimatın keçirilməsinə görə ADPU-nun rəhbərliyinə təşəkkür edib. Bildirib ki, təhsil cəmiyyət həyatının strateji sahəsidir. Təhsil daim yenilənməli, inkişaf etməlidir. Səriştə əsaslı təhsil təhsil islahatlarının uğurla həyata keçirilməsi və bütövlükdə təhsil sahəsinin inkişafı üçün olduqca vacibdir. Səriştə əsaslı təhsil "Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası"nda həyata keçiriləcək əsas vəzifələrdən biri kimi qarşıya qoyulub. Hazırda universitetlərin təhsil-tədqiqat innovasiya mərkəzlərinə çevrilməsi aktual vəzifədir. Universitetlərin tədqiqat universitetlərinə çevrilməsi istiqamətində tədbirlər həyata keçirilir. Bu vəzifənin uğurla həyata keçirilməsində səriştə əsaslı təhsil mühüm rol oynayır. Səriştə-bilik, bacarıq, təcrübə, qabiliyyətdir. Səriştə biliyə əsaslanır, bacarıq və qabiliyyətin məcmusu kimi qiymətləndirilir. Səriştə məxsusi bilikdir, spesifik qabiliyyətdir. Biliklərin praktiki istifadəsi vacibdir. Səriştə əsaslı təhsildə nəzəriyyə praktika ilə birləşdirilir, elmi-nəzəri biliklər əməli fəaliyyətdə tətbiq edilir. Səriştə kokret fəaliyyət nəticəsində əldə edilir, konkret şəraitdə özünü büruzə verir. Səriştə peşəkar fəaliyyət üçün başlıca meyardır. Səriştə əsaslı təhsil müasir dünyada geniş yayılmış ömürboyu təhsil üçün də vacibdir. Təhsilyönümlü ali təhsildən təlimyönümlü ali təhsilə keçid qarşımızda vacib bir vəzifə kimi dayanır. Tələbə-gənclərə elmi-tədqiqat fəaliyyəti aşılanmalı, onlarda elmi-tədqiqat metodologiyalarından istifadə bacarıqları formalaşdırılmalıdır.

Təhsil ekspertləri professor Şahlar Əsgərov, fəlsəfə doktoru Etibar Əliyev çıxış edərək təqdimatı yüksək qiymətləndiriblər.

Tədbirdə ADPU-da son vaxtlar səriştə əsaslı təhsil baxımından pedaqoji təhsilin məzmununda, təhsil prosesinin təşkilində baş verən dəyişikliklər, müəllim hazırlığına spesifik yanaşmalar və digər vacib məqamlarla bağlı maraqlı və səmərəli fikir mübadiləsi aparılıb, iştirakçıların sualları cavablandırılıb.

ADPU-nun rektoru, professor Cəfər Cəfərov tədbirə yekun vuraraq yüksək səviyyəli konseptual təqdimata görə A. Cahangirova təşəkkür edib və ziyalılıq mühitinin formalaşmasında böyük önəm kəsb edən belə təqdimatların gələcəkdə də ardıcıl keçiriləcəyini vurğulayıb.

**Könül Nərimanqızı**

# "Fəryad edən Xocalı" inteqrativ dərsi

**Fevralın 23-də Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) Xocalı soyqırımının iyirmi altıncı ildönümünə həsr edilmiş "Fəryad edən Xocalı" inteqrativ dərs keçirilib. Tədbirdə ADPU-nun rəhbərliyi, Pakistanın Azərbaydankı fövqəladə və səlahiyyətli səfiri Saeed Khan Mohmand, İraqın fövqəladə və səlahiyyətli səfiri Fadhil Awad Al-Shuwaili, Sudan səfirliyinin müşaviri Awadia Ahmed Yahya, İordaniya səfirliyinin I katibi Saad El Gazali, fakültə dekanları, kafedra müdirləri, müəllim və tələbələr, qeyri-hökumət təşkilatlarının təmsilçiləri və kütləvi informasiya vasitələrinin əməkdaşları iştirak ediblər. Tədbirdən öncə iştirakçılar Xocalı soyqırımının əks etirən rəsm əsərlərindən ibarət sərgi ilə tanış olublar. Tədbirdə əvvəlcə Xocalı soyqırımı zamanı şəhid olan soydaşlarımızın və eləcə də bütün şəhidlərimizin xatirələri bir dəqiqəlik sükutla yad edilib.**




Tədbiri giriş sözü ilə açan Elm və innovasiyalar şöbəsinin müdiri, dosent Yusif Alıyev bildirib ki, Xocalı soyqırımından iyirmi altı il keçir. Xocalı faciəsi XX əsrdə ermənilər tərəfindən xalqımıza qarşı törədilmiş növbəti kütləvi qırğın olmaqla bərabər, həm də Azərbaycanın ərazi bütövlüyünə və dövlət müstəqilliyinə qarşı yönəlmiş ənənəvi terror siyasətinin tərkib hissəsidir. Bu soyqırımı həm də bəşəriyyətə və insanlığa qarşı yönəlmiş ən qəddar cinayətlərdən biridir. Xocalı soyqırımı beynəlxalq hərbi cinayət aktıdır. Namərd və xain qonşularımız olan ermənilər keçmiş Sovet Ordusunun Xankəndidə yerləşən 366-cı motoatıcı alayının köməyi ilə 1992-ci il fevralın 25-dən 26-na keçən gecə 7 min əhalisi olan Xocalıda dəhşətli və qəddar bir cinayət törətdilər. Xocalı faciəsi bəşər tarixində misli görünməmiş bir cinayət aktıdır. Xocalı soyqırımının beynəlxalq ictimaiyyətə çatdırılması ilə bağlı əməli tədbirlər yalnız ulu öndərimiz Heydər Əliyevin xalqımızın çox böyük istəyi və inadlı tələbi ilə Azərbaycanda yenidən dövlət rəhbərliyinə qayıtmasından sonra həyata keçirildi. Xocalı faciəsi zamanı həlak olmuş soydaşlarımızın ailələləri həmişə Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyevin diqqət mərkəzindədir.

İraqın fövqəladə və səlahiyyətli səfiri Fadhil Awad Al-Shuwaili, Sudan səfirliyinin müşaviri Awadia Ahmed Yahya çıxış edərək Xocalı soyqırımının yalnız Azərbaycan xalqına qarşı deyil, bütövlükdə bəşəriyyətə qarşı yönəlmiş böyük hərbi cinayət olduğunu bildirərək təmsil etdikləri ölkələrin Xocalı faciəsini soyqırımı kimi tanıdıqlarını və Azərbaycanın ərazi bütövlüyünü dəstəklədiyini vurğulayıblar.

Dərsdə Tarix və coğrafiya, Filologiya, Musiqi, təsviri incəsənət, fiziki tərbiyə və çağırışaqədər hazırlıq fakültələrinin tələbə-gənclərindən ibarət "Coğrafiya", "Tarix", "Filologiya", "Musiqi" qruplarının Xocalının tarixi, coğrafi ərazisi, Xocalı soyqırımı, ədəbiyyatımızda, incəsənətimizdə Xocalı mövzusu, həmçinin bir xalq, millət olaraq siyasi və strateji hədəflərimizlə bağlı təməl və tədqiqat sualları əsasında təqdimatları dinlənilib.

Tədbirdə Xocalı soyqırımının şahidi olmuş Fituhat Məmmədova çıxış edərək faciə ilə bağlı acı xatirələrini bölüşüb.

Yazıçı Elxan Elatlı, "Xocalı Soyqırımını Tanıtma" İctimai Birliyinin sədri Şamil Sabiroğlu çıxış edərək Xocalı soyqırımı zamanı ermənilərin törətdikləri vəhşilikləri konkret faktlarla tədbir iştirakçılarının diqqətinə çatdırıblar.

Tədbirdə çıxış edən ADPU-nun rektoru, professor Cəfər Cəfərov tədbirin təşkilatçılarına təşəkkür edib. Rektor qeyd edib ki, bu dərs hamımız üçün gözəl bir nümunədir. Belə dərslər milli duyğularımızı, vətənpərvərlik hisslərimizi gücləndirir. Qələbə günü yaxındadır. Bu qələbə gününü yaxınlaşdıran Azərbaycan Respublikasının Prezidenti, Ali Baş Komandan cənab İlham Əliyevin əmrini gözləyən hərbçilərimiz, diplomatlarımız, ziyalılarımızdır. Bu, böyük bir ordudur. Müəllimlər də bu ordunun nümayəndələridir. Biz gənc nəsli savadlı, bilikli, bacarıqlı, vətənpərvər yetişdirməliyik. "Öncə Vətəndir!" bizim həyat amalımız, fəaliyyət devizimiz olmalıdır.

Tədbirin sonunda hazırladıqları təqdimatlara görə qruplara sertifikatlar təqdim edilib.

**"Gənc müəllim"**

# İhsan Doğramacının vəfatının səkkizinci ildönümünə həsr olunmuş anım tədbiri



Fevralın 23-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) nəzdində Azərbaycan Dövlət Pedaqoji Kollecində (ADPK) dünya şöhrətli alim, məşhur pediatr, Azərbaycan xalqının böyük dostu, professor İhsan Doğramacının vəfatının səkkizinci ildönümünə həsr olunmuş anım tədbiri keçirilib.

Əvvəlcə kollecin foyesində tələbələrin əl işlərindən ibarət sərgi nümayiş olunub. Sonra tədbir Azərbaycanın və Türkiyənin dövlət himnlərinin səsləndirilməsi ilə açıq elan edilib. Tədbiri giriş sözü ilə kollecin Tədris işləri üzrə direktor müavini, pedaqogika üzrə fəlsəfə doktoru Məhbubə Məmmədova açaraq qonaqları tədbir iştirakçılarına təqdim edib və bu günün mahiyyəti haqqında qısa məlumat verib. Kollecin direktoru, hüquq üzrə fəlsəfə doktoru Qulu Novruzov görkəmli alimin həyat və yaradıcılığı haqqında ətraflı məlumat verərək, Azərbaycan və Türkiyə dövləti arasında dostluq və qardaşlıq münasibətindən danışıb.

Dəvət olunanlar arasında Türkiyənin Azərbaycandakı Səfirliyinin təhsil müşaviri Abdulğafur Böyükfırat, Bilkent Universitetinin bölgə ölkələri kurs programları direktoru, professor Rasim Özyürek, Azərbaycan Milli Elmlər Akademiyasının (AMEA) Dilçilik İnstitutunun direktoru, akademik Möhsün Nağısoylu, Bakı Dövlət Universitetin kafedra müdiri, professor Ramiz Əskər, ADPU-nun dekanı, dosent Şahin Pənahov kimi alimlər tədbirdə iştirak ediblər. Onların görkəmli şəxsiyyət haqqında çıxışları dinlənilib. Çıxışda qeyd olunub ki, Türkiyənin tanınmış elm nümayəndələrindən biri, ictimai-siyasi xadim İhsan Doğramacı 2000-ci ildə Azərbaycanın "İstiqlal" ordeni, 2005-ci ildə isə ən ali mükafatı olan "Heydər Əliyev" ordeni ilə təltif olunub. Həmçinin o, dünyanın bir sıra ölkələrinin və beynəlxalq təşkilatların nüfuzlu mükafatlarına da layiq görülüb.

Tədbirdə İ.Doğramacının həyatından, ictimai-siyasi fəaliyyətindən bəhs edən sənədli film nümayiş olunub. Tələbələrin ifasında səslənən musiqili kompozisiya tədbir iştirakçıları tərəfindən maraqla qarşılanıb. Sonda qonaqlara xatirə hədiyyələri təqdim olunub.

# Elmi Şuranın iclası

**Fevralın 28-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Elmi Şurasının iclası keçirilib. ADPU-nun rektoru, Elmi Şuranın sədri, professor Cəfər Cəfərov iclası giriş sözü ilə açaraq bildirib ki, iclasın gündəliyinə ADPU-da payız semestrinin imtahan sessiyasının yekunları barədə, 2017-ci il üçün fəlsəfə doktoru proqramı üzrə doktorantura və dissertanturaya, elmlər doktoru proqramı üzrə dissertanturaya qəbulun nəticələri barədə, Tələbə Elmi Cəmiyyətinin fəaliyyəti haqqında, Nəşriyyat şöbəsinin fəaliyyəti haqqında və cari məsələlər daxildir.**



İclasın gündəliyi səsə qoyularaq qəbul edilib.

Tədris işləri üzrə prorektor, dosent Eldar Aslanov payız semestrinin imtahan sessiyasının nəticələri haqqında məlumat verib. Bildirib ki, payız semestrinin imtahan sessiyasını keçirmək üçün bütün hazırlıq işləri və təşkilati məsələlər vaxtında yekunlaşdırılıb. Universitetdə imtahan sessiyasına hazırlıq və imtahanların keçirilməsi üçün müvafiq əmr verilib. Apelyasiya Komissiyası, həmçinin fakültələr, Magistratura və doktorantura şöbəsi üzrə apelyasiya komissiyaları yaradılıb, fakültə dekanlarının, kafedra müdirlərinin və digər struktur bölmələrin həyata keçirəcəkləri vəzifələr müəyyən edilib. Eyni zamanda universitetdə İmtahan Qərargahı yaradılıb. İmtahanlar yanvarın 4-dən fevralın 2-dək tərtib olunmuş cədvəl üzrə keçirilib. İmtahanlar ali təhsilin bakalavriat səviyyəsində I-II tədris ili tələbələri üçün yazılı formada, III-IV tədris ili tələbələri üçün isə spesifik fənlər istisna olmaqla, kompüter vasitəsilə test üsulu formasında, magistratura səviyyəsində isə yazılı şəkildə keçirilib. Universitetdə bütün aralıq qiymətləndirmələr, semestr və dövlət imtahanları Tədris Departamentinin İmtahan, monitorinq və qiymətləndirmə şöbəsi tərəfindən həyata keçirilib və vahid mərkəzdən idarə olunub. İmtahan Qrupu yaradılıb, bütün imtahanların təşkili və imtahanlarla əlaqəli bütün funksiyaların icra edilməsi bu qrupa həvalə edilib. Təhsil Nazirliyinin müvafiq əmrinə uyğun olaraq ADPU-da tələbələrə 2 fənni dinləmədən fevralın 5-dən 9-dək akademik kredit borclarını ödəmək üçün lazımi şərait yaradılıb. Həmçinin universitetdə tələbələrin valideynlərinin, təhsil sahəsində fəaliyyət göstərən qeyri-hökumət təşkilatlarının və kütləvi informasiya vasitələri nümayəndələrinin, təhsil ekspertlərinin imtahan prosesini izləmələrinə xüsusi diqqət yetirilib. İmtahan prosesində nizam-intizam, səliqə-sahman təmin olunub, ADPU-da fəaliyyət göstərən İctimai Şura da imtahan prosesinə ciddi nəzarət edib. ADPU-nun 5 filialında-Ağcabədi, Şəki, Şamaxı, Quba və Cəlilabad filiallarında, həmçinin ADPU-nun nəzdində Azərbaycan Dövlət Pedaqoji Kollecində payız semestrinin imtahan sessiyası şəffaf və ədalətli keçirilib. Dosent E.Aslanov çıxışının sonunda tədris və imtahan prosesinin daha səmərəli qurulması üçün təkliflərlə çıxış edib.

Apelyasiya Komissiyasının sədri, dosent Zahir Kazımov apelyasiya nəticələri haqqında məlumat verib. Qeyd edib ki, payız semestrinin imtahan sessiyasında Apelyasiya Komissiyasına 1501 müraciət edilib. Müraciətlər çevik şəkildə və diqqətlə araşdırılıb, müvafiq qərarlar qəbul edilib. Dəyişiklik edilməyən qiymətlərin ümumi sayı 1120, qiyməti artırılan işlərin sayı isə 381 olub. (25,3%). Bu il yazılı imtahanların sayınını 2 dəfə artmasına, Apelyasiya Komissiyasına edilən müraciətlərin sayının isə 260 nəfər artmasına baxmayaraq, qiyməti artırılan tələbələrin sayı 157 (17,7%) nəfər azalıb.

Elmi Şura dosent E.Aslanovun və dosent Z.Kazımovun hesabatlarını və təkliflərini qəbul edib.

2017-ci il üçün fəlsəfə doktoru proqramı üzrə doktorantura və dissertanturaya, elmlər doktoru proqramı üzrə dissertanturaya qəbulun nəticələri barədə Elm və innovasiyalar üzrə prorektor, professor Asəf Zamanov məlumat verib. Professor A.Zamanov bildirib ki, Təhsil Nazirliyinin müvafiq məktubuna əsasən ADPU-da fəlsəfə doktoru proqramı üzrə doktoranturaya və dissertanturaya, elmlər doktoru proqramı üzrə dissertanturaya qəbulla bağlı "Azərbaycan" qəzetinin 28 dekabr 2017-ci il tarixli 288-ci nömrəsində elan dərc edilib, 19 yanvar 2018-ci il tarixə qədər sənəd qəbulu aparılıb. Planda nəzərdə tutulmuş ixtisaslar üzrə 68 nəfərin sənədi (fəlsəfə doktoru proqramı üzrə dokto□ran□turaya-47 sənəd, dissertanturaya- 9 sənəd, elmlər doktoru proqramı üzrə dissertanturaya-12 sənəd) qəbul edilib. Rektorun 29 dekabr 2017-ci il tarixli 3/184 nömrəli əmrinə əsasən yaradılmış Sənəd Qəbulu Komissiyasının 30 yanvar 2018-ci il tarixli iclasının qərarına əsasən qəbul müsahibəsinə fəlsəfə doktoru proqramı üzrə dissertanturaya 2 nəfər, elmlər doktoru proqramı üzrə dissertanturaya 3 nəfər buraxılmayıb. Rektorun 31 yanvar 2018-ci il tarixli 3/17 nömrəli əmrinə əsasən yaradılmış müvafiq komissiyalar tərəfindən 5-16 fevral 2018-ci il tarixlərdə imtahanlar və müsahibələr aparılıb. İmtahan və müsahibələrin nəticələri əsasında fəlsəfə doktoru proqramı üzrə dokto□ran□turaya 11 nəfər, dissertanturaya 3 nəfər, elmlər doktoru proqramı üzrə dissertanturaya 5 nəfər qəbul olunub. İmtahanlar və müsahibələr şəffaf və obyektiv keçirilib.

Elmi Şura professor A.Zamanovun hesabatını qəbul edib.

Tələbə Elmi Cəmiyyətinin fəaliyyəti haqqında çıxış edən TEC-in sədri, dosent Əli Zalov bildirib ki, tələbələr laboratoriya işləri, referatlar, məruzələr, layihələr hazırlayıb, fənn olimpiadalarında iştirak edib, kurs, buraxılış işlərini, tədqiqat xarakterli qeyri-tip konkret məsələləri yerinə yetirib, konkret mövzu üzərində müstəqil araşdırmalar aparıb. Bütün fakültələrdə TEC-in konfransları keçirilib. Tələbələrin elmi konfranslarda, olimpiadalarda, müxtəlif yarışlarda iştirakı təşkil edilib. Fərqlənən tələbələr sertifikatlara, diplomlara, fəxri fərmanlara, təşəkkürnamələrə layiq görülüblər.

Elmi Şura dosent Ə.Zalovun hesabatını qəbul edib.

Nəşriyyat şöbəsinin fəaliyyəti haqqında şöbənin müdiri Hüseyn Hacıyev məlumat verib. Diqqətə çatdırıb ki, 2016-cı ilin yanvar ayından 2018-ci ilin yanvar ayına kimi şöbədə 596 sifariş yerinə yetirilib. 28 adda dərslik və dərs vəsaiti, 192 adda proqram, metodik göstəriş və metodik vəsaitlər, 4 adda konfrans materialları və 5 adda ildə 4 dəfə olmaqla elmi-metodik jurnallar çap olunub. Tələbə biletləri, dərs jurnalları və pedaqoji təcrübə jurnalları, tədrisə aid bütün forma və blanklar vaxtında çap edilib. H.Hacıyev çıxışının sonunda Nəşriyyat şöbəsinin təmir olunmasına, istilik sisteminin yenidən qurulmasına və işçilər üçün normal iş şəraiti yaradılmasına görə ADPU-nun rəhbərliyinə təşəkkür edib.

Elmi Şura H.Hacıyevin hesabatını qəbul edib.

Dosent Sənan Əliyev, professor Malik Cəbrayılov, professor Buludxan Xəlilov, professor Fərrux Rüstəmov, professor Əli Allahverdiyev, professor Nailə Verdizadə, dosent Şahin Nəcəfov, dosent Maqsud Nəcəfov, hüquq üzrə fəlsəfə doktoru Qulu Novruzov, baş müəllim Lalə Mürsəlbəyova və başqaları çıxış edərək sessiya müddətində fakültələrin nəticələrinin təhlili, tələbələrin biliklərinin qiymətləndirmə meyarları, tədris proqramları və sillabuslardan istifadə edilməsi ilə bağlı təkliflər irəli sürüblər.

İclasda rektor Cəfər Cəfərov dosent Sakibə Ələsgərovaya "Əməkdar müəllim" fəxri adının medalını, Həmkarlar İttifaqı Komitəsinin sədri, dosent Vaqif Əliyevə Təhsil Nazirliyinin "Azərbaycan Respublikası qabaqcıl təhsil işçisi" döş nişanını, Tələbə Həmkarlar Komitəsinin sədri, dosent Vurğun Məmmədova isə Azərbaycan Həmkarlar İttifaqları Konfederasiyasının "AHİK-in 25 illik Yubiley döş nişanı"nı təqdim edərək onlara uğurlar arzulayıb.

İclasda dosent attestatları, fəlsəfə doktoru diplomu təqdim edilib.

Sonda Elmi katib, siyasi elmlər üzrə fəlsəfə doktoru Asif Axundov cari məsələlər barədə məlumat verib. Cari məsələlər müzakirə edilib və müvafiq qərarlar qəbul olunub.

**Mənsur Qüdrətoğlu**

# ADPU-ya yeni qəbul olunmuş doktorant və dissertantlarla görüş



Fevralın 23-də Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) 2017-ci il üçün fəlsəfə doktoru proqramı üzrə doktoranturaya və dissertanturaya, elmlər doktoru proqramı üzrə dissertanturaya qəbul olunmuş şəxslərlə görüş keçirilib.

ADPU-nun rektoru, professor Cəfər Cəfərov yeni qəbul olunmuş doktorant və dissertantları təbrik edib, onlara gələcək elmi fəaliyyətlərində uğurlar arzulayıb. Bildirib ki, təhsil hər bir xalqın, millətin həyatının ən vacib sahəsi, hərtərəfli inkişafının əsas amilidir. Müasir təhsil sistemində ən aktual vəzifələrdən biri yüksək səviyyəli elmi-pedaqoji kadrların hazırlanmasıdır. Rektor doktorant və dissertantlara dil biliklərini artırmağı tövsiyə edib.

Elm və innovasiyalar üzrə prorektor, professor Asəf Zamanov çıxışında doktoranturaya və dissertanturaya qəbulun nəticələri barədə məlumat verib. Professor A.Zamanov qəbulda şəffaflıq və obyektivliyin böyük əhəmiyyət kəsb etdiyini vurğulayıb, yeni qəbul olunmuş doktorant və dissertantların özlərini doğruldacaqlarına inamını ifadə edib və onlara uğurlar arzulayıb.

Görüşdə çıxış edən doktorant və dissertantlar imtahanların şəffaf və obyektiv keçirilməsinə görə ADPU-nun rəhbərliyinə təşəkkür edərək onlara göstərilən etimadı doğruldacaqlarını bildiriblər.

Sonda doktorant və dissertant vəsiqələri verilib, xatirə şəkilləri çəkdirilib.

# Musiqi, təsviri incəsənət, fiziki tərbiyə və çağırışaqədər hazırlıq fakültəsinin Elmi Şurasının iclası



Fevralın 9-da Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Musiqi, təsviri incəsənət, fiziki tərbiyə və çağırışaqədər hazırlıq fakültəsinin Elmi Şurasının iclası keçirilib. Elmi Şuranın iclasında Musiqi və onun tədrisi metodikası kafedrasının müəllimi, Əməkdar incəsənət xadimi Nailə Mirməmmədlinin və Təsviri incəsənət və onun tədrisi metodikası kafedrasının dosenti, Əməkdar rəssam Rəis Rəsulovun Azərbaycan Respublikasının Dövlət Mükafatına kafedralardan namizədlikləri irəli sürülüb.

İclasda Musiqi, təsviri incəsənət, fiziki tərbiyə və çağırışaqədər hazırlıq fakültəsinin dekanı, fəlsəfə üzrə fəlsəfə doktoru, dosent Laçın Həsənova, Musiqi və onun tədrisi metodikası kafedrasının müdiri, professor Zemfira Abdullayeva, Təsviri incəsənət və onun tədrisi metodikası kafedrasının müdiri, pedaqogika üzrə elmlər doktoru, dosent Çingiz Rüstəmov çıxış edərək namizədlərin irəli sürülməsini dəstəkləyiblər.

# Xarici ekspertin silsilə seminarları davam edir





Məlumat üçün qeyd edək ki, Lehigh Universitetinin professoru, təhsil üzrə ekspert xanım Jill Sperandionun Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) "Yeni öyrətmə təcrübələri adlı" silsilə seminarları davamlı olaraq təşkil edilir.

Tədqiqat və inkişaf şöbəsinin təşkilatçılığı ilə fevralın 13-də Tarix və coğrafiya, fevralın 21-də isə Filologiya fakültəsinin professor-müəllim heyəti üçün təlimlər təşkil olundu. Ümumən 19 nəfərin iştirak etdiyi seminarların keçirilməsində əsas məqsəd cəmiyyətlə birlikdə təhsil sisteminin də dəyişib inkişaf etdiyi bir dövrdə müəllim heyətini müasir təlim metodları ilə tanış etmək və bu metodların tədris prosesində tətbiqi yollarını araşdırmaq qabiliyyətlərini inkişaf etdirməkdən ibarətdir.

Təlim zamanı interaktiv təlim metodlarından istifadə olundu, qrup şəklində təqdim olunan mövzular ətrafında müzakirələr aparıldı. Sonda iştirakçılar bu kimi təlimlərin davamlı olmasını arzu etdiklərini bildirdilər.

Qeyd edək ki, gələcək günlərdə digər fakültələrin professor-müəllim heyəti üçün analoji seminarların keçirilməsi nəzərdə tutulub.

# ADPU-nun əməkdaşı Orxan Abdullayev I Beynəlxalq PR Yaradıcılığı Forumunda iştirak edib





Fevralın 17-18-də Azərbaycanda ilk dəfə I Beynəlxalq PR Yaradıcılığı Forumu keçirilib. Tədbirdə öncə Azərbaycan Respublikasının Dövlət Himni səsləndirilib.

Yüksək səviyyədə keçən Forumda ictimaiyyətlə əlaqələr sahəsinin inkişafı məsələsindən danışılıb. Bu sahədə mövcud vəziyyət təhlil edilib, atılan müsbət addımlar, həyata keçirilən əməli tədbirlər təqdir olunub, eyni zamanda çatışmazlıqların aşkara çıxarılıb onların aradan qaldırılması yolları müzakirə edilib.

Forumda Azərbaycan Mətbuat Şurasının sədri, millət vəkili Əflatun Amaşov, Beynəlxalq PR Assossiasiyasının prezidenti Bart de Vries, Girne Amerikan Universiteti və Kipr Amerikan Universitetinin qurucusu və İdarə Heyətinin sədri Serhat Akpınar, Stage PR şirkətinin rəhbəri Zehra Güngör, PR və Kommunikasiyanın İdarə Edilməsi üzrə Qlobal Alliance-ın rəhbəri Jose Manuel Velasco və başqaları iştirak ediblər.

Forumda ADPU-nun İctimaiyyətlə əlaqələr və marketinq şöbəsinin müdir müavini Orxan Abdullayev də iştirak edib. Qeyd edək ki, Forum ictimaiyyətlə əlaqələr sahəsində qabaqcıl beynəlxalq təcrübənin öyrənilməsi, fikir mübadiləsinin aparılması və qarşıda duran vəzifələrin müəyyən edilməsi baxımından mühüm əhəmiyyət kəsb edir.

# Dövlətin gənclər siyasətinin uğurları

**Ölkəmizdə həyata keçirilən siyasətin başlıca istiqamətlərindən biri də gənclərə dövlət dəstəyinin gücləndirilməsi, onlara hərtərəfli diqqət göstərilməsidir. Hər bir dövlətin əsas missiyası gələcəyini etibar edəcəyi nəsil hazırlamaqdır.**

Bu gün Azərbaycanda gənclər siyasəti dövlət siyasətinin mühüm tərkib hissəsidir. Azərbaycan gəncliyi ictimai həyatın bütün sferalarında aktiv fəaliyyəti ilə seçilir və siyasi, iqtisadi, humanitar, sosial tədbirlərin həyata keçirilməsində mühüm rol oynayır. Dövlətin gənclərin fəaliyyəti üçün yaratdığı geniş imkanlar nəticəsində bu təbəqə cəmiyyətin əsas qüvvəsinə çevrilib. Son illərdə respublikamızın əksər regionlarında müasir standartlara cavab verən Gənclər mərkəzləri, Uşaq yaradıcılıq mərkəzləri istifadəyə verilib, orta və ali təhsil ocaqları müasir informasiya-kommunikasiya texnologiyaları ilə təmin olunub. Bu gün ölkədə gənc nəslə diqqət və qayğı dövlətin ən mühüm fəaliyyət istiqamətlərindən birinə çevrilib. Azərbaycan gənclərinin təşkilatlanması əsas məqsədlərdən biri kimi qarşıya qoyulub. Uğurla həyata keçirilən dövlət gənclər siyasəti bu gün gənclərin ölkə həyatının bütün sahələrindəki fəallığını daha da artırıb. Azərbaycanda gənclərin inkişafı üçün dövlət səviyyəsində kifayət qədər işlər görülüb, uşaq və gənclərin qeyri-hökumət təşkilatlarının yaradılması, fəaliyyətlərinin təşkili üçün şərait yaradılıb.

Gənclərin verilən imkanlardan layiqincə yararlanıb həm öz inkişafını təmin etmək, həm də dövlətimizin mənafeyini etibarlı şəkildə müdafiə etmək üçün yüksək elm və təhsilə, qabiliyyət və bacarıqlara yiyələnmələri vacibdir. Məhz belə gənclərdən biri olan Riyad Rüstəmli Bakı Dövlət Universitetinin Politologiya və sosiologiya kafedrasının doktorantıdır. Onun məqalələri Respublikamızın və digər ölkələrin nüfuzlu elmi məcmuələrində işıq üzü görür. Bundan əlavə, o, mütəmadi olaraq ümumrespublika və beynəlxalq konfranslarda elmi məruzələrlə çıxış edir.

Riyad Rüstəmli hələ universitet illərində fakültə əlaçısı olmaqla yanaşı, ictimai fəaliyyəti ilə də seçilən tələbə olmuşdur. Belə ki, o, universitetdə təhsil aldığı illərdə BDU üzgüçülük yığma



komandasının üzvü, Sosial Elmlər və Psixologiya fakültəsinin Gənclər Təşkilatının sədri olmuşdur. 2009-2013-cu illərdə Azərbaycan Tələbə Gənclər Təşkilatları İttifaqının (ATGTİ) layihələr Koordinatoru, iş icraçısı kimi könüllü fəaliyyət göstərmişdir. Həmin dövrdə Gənclər və İdman Nazirliyinin təşkilatçılığıyla ATGTİ tərəfindən keçirilən "Gənc liderlər" (2010) üçün təşkil olunmuş düşərgənin iştirakçısı olaraq bir çox uğurlara imza atmışdır. 2012-2013-cü ilin tədris ilində BDU-da "İlin ən yaxşı tələbəsi" müsabiqəsinin qalibi olan Riyad Rüstəmli geniş erudisiyalı gənc kimi universitetin tarixinə düşmüşdür.

Bundan əlavə, Riyad Rüstəmli bir çox beynəlxalq layihələrin, tədbirlərin iştirakçısı və qalibi kimi də vətənimizin adını şərəflə təmsil etmişdir.

2010-2013-cü ildə SIFE (Students In Free Enterprisers ) komandasının rəhbəri kimi "Ali məktəblər arası ən yaxşı sosial layihə" nominasiyasının qalibi olaraq ona göstərilən etimadı doğrultmuşdur. 2011-ci ildə Gürcüstanın Anaklia adasında Dünya Gənclərinin iştirak etdiyi düşərgədə Azərbaycanı layiqincə təmsil etmişdir. 2011-ci ildə MDB gənc Liderləri üçün təşkil olunmuş düşərgənin qalib komandasının rəhbəri olaraq vətəninə növbəti uğuru qazandırmışdır. Düşərgənin "Ən yaxşı kapitan"ı nominasiyanin qalibi seçilmişdir.

Riyad Rüstəmli müvəffəqiyyətli tələbə olmaqla yanaşı, uğurlu təcrübə məktəbi də keçmişdir. O, 2012-2013-cü illərdə Azərbaycan Respublikası Prezidenti Yanında Strateji Araşdırmalar Mərkəzində iş təcrübəsində olmuş və kursu uğurla bitirmişdir. 2012-ci ildə Bakıda keçirilən Avroviziya Mahnı Müsabiqəsinin təşkilat komitəsində ictimai əsaslarla fəaliyyət göstərmişdir. 2013-cü ildə İslam Əməkdaşlıq təşkilatına üzv ölkələrin beyin mərkəzlərinin III Forumunun Təşkilat komitəsinin üzvü olaraq orada ictimai əsaslarla fəaliyyət göstərmişdir. Eyni zamanda, Gənclər və İdman Nazirliyində (ictimai əsaslarla) nazirin köməkçi heyətinin üzvü olmuşdur.

Təhsil və təcrübə sahəsində bir çox uğura imza atan Riyad Rüstəmli vətən sevgisini hər şeydən üstün tutaraq 2013-2014-cü illərdə hərbi xidmətdə olmuşdur. Xidmət vaxtı da xüsusi bacarıqları, şəxsi keyfiyyətləri ilə seçilən Riyad Rüstəmli "Döyüş, ictimai-siyasi hazırlığında və nizam-intizamında yüksək nailiyyətlər əldə etdiyinə görə" komandanlıq tərəfindən Fəxri fərmanla təltif edilmiş və dəfələrlə təşəkkürə layiq görülmüşdür.

Riyad Rüstəmli vətənə xidmətini uğurla başa vurduqdan sonra özəl təşkilatlarda rəhbər vəzifələrdə çalışmışdır. O, fəaliyyət göstərdiyi hər yerdə işinə göstərdiyi məsuliyyəti ilə seçilmiş və məhz bu keyfiyyətləri sayəsində 2016-cı ildə Azərbaycan Dövlət Pedaqoji Universitetinə rektor köməkçisi vəzifəsinə təyin edilmişdir. Bu təyinat həm də ADPU-nun rektoru, professor Cəfər Cəfərovun Azərbaycan Respublikası Prezidenti İlham Əliyevin gənclər siyasətini dəstəklədiyindən irəli gəlmişdir. Riyad Rüstəmli isə öz növbəsində professor Cəfər Cəfərovun etimadını doğrultmuş və bir ildən sonra Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) Yeni Azərbaycan Partiyasının (YAP) Səbail rayon təşkilatının "Pedaqoqlar" ərazi təşkilatının sədr müavini seçilmişdir. Onu da qeyd edək ki, Riyad Rüstəmli özünü tanıyandan Ümummilli lider Heydər Əliyev siyasətinin dəstəkləyən gənclərdən olmuş və 18 yaşı tamam olan gündən partiya sıralarına daxil olmuşdur.

Çalışdığı kollektivdə hamının rəğbətini qazanan Riyad Rüstəmli universitet rəhbərliyinin göstərişi əsasında ali məktəblə bağlı əksər işlərin təşkilində, bir çox tədbirlər planının reallaşmasında öz fəallığı və operativliyi ilə seçilir. Riyad Rüstəmli ADPU-nun digər gənc kadrları kimi daim professor Cəfər Cəfərovun diqqətindədir. Riyad Rüstəmlinin gərgin və çoxtərəfli fəaliyyəti dövlət gənclər siyasəti tərəfindən də yüksək qiymətləndirilmiş və o, 2 fevral 2018-ci il tarixində Gənclər günü münasibətilə Azərbaycan Respublikası Prezidentinin İctimai-siyasi məsələlər üzrə köməkçisi - şöbə müdiri Əli Həsənov tərəfindən fəxri fərmanla təltif edilmişdir.

Bu isə dövlət gənclər siyasətinin apardığı uğurlu işlər nəticəsində Riyad kimi aktiv gənclərin mədəniyyət, incəsənət, idman, elm, təhsil, texnologiya və başqa sahələrdə öz istedadlarını və qazandıqları uğurları layiqincə nümayiş etdirə bilməsindən irəli gəlir. Əgər əvvəllər istedadlı Azərbaycan gənci öz potensialını üzə çıxarmaq üçün şəraitin olmamasından haqlı olaraq gileylənirdisə, indi vəziyyət tam başqadır. Hər bir perspektivli Azərbaycan gəncinin yetişməsi üçün ölkəmizdə dövlət tərəfindən lazımi şərait yaradılmışdır. Həqiqətən də bu gün Azərbaycanda gənclər siyasətinin qarşısında duran əsas məqsədlər əsasən bu sahənin intellektual səviyyəsinin artırılması, gənclərimizin və yeniyetmələrimizin elmə, təhsilə yiyələnmələrinə nail olunması, iqtisadi amillər - yəni maliyyə durumlarının, sosial rifah göstəricilərinin yüksək olması, onların arasında azərbaycançılıq ideologiyasının, milli-mənəvi dəyərlərin mənimsənilməsi, gənclərimizin dövlət və hökumət strukturlarında geniş təmsil olunması və s. prioritet məsələlərdir.

Sonunda onu da qeyd edə bilərik ki, Azərbaycan dövləti ölkə gənclərinin bütün problemlərini həll edib, onlara hərtərəfli qayğı və diqqət göstərdiyi kimi, gənclərimiz də dövlətin etimadını hər addımda doğruldur, bütün sahələrdə xalqımıza üz ağlığı gətirirlər. Riyad Rüstəmlinin: "Biz hər gün, hər addımda şahidi oluruq ki, "Azərbaycan gəncliyi öz dövləti və lideri ətrafında sıx birləşmişdir" - fikri isə həqiqətən də günün reallığıdır.

**Məlahət Babayeva**

# Məktəbəqədər təhsil, psixoloji xidmət və korreksiyaedici təlim fakültəsinin Elmi Şurasının geniş tərkibdə iclası

Fevralın 12-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Məktəbəqədər təhsil, psixoloji xidmət və korreksiyaedici təlim fakültəsinin Elmi Şurasının geniş tərkibdə iclası keçirilib. İclası giriş sözü ilə fakültənin dekanı, Elmi Şuranın sədri, pedaqogika üzrə elmlər doktoru Şəhla Əliyeva açıb. Elmi Şuranın katibi iclasın gündəliyində duran məsələlərlə Şura üzvlərini tanış edərək bildirib ki, gündəliyə payız semestrinin imtahan sessiyasının yekunları və qarşıda duran vəzifələr, pedaqoji təcrübəyə hazırlıq və cari məsələ daxildir.

Payız semestrinin imtahan sessiyasının yekunları və qarşıda duran vəzifələr barədə fakültə Elmi Şurasının sədri Şəhla Əliyeva ətraflı məruzə edib. Məruzə ətrafında ciddi və səmərəli müzakirələr aparılıb. Professor



Müseyib İlyasov, dosent Nurəngiz Rzayeva və digər müəllimlər çıxış edərək öz fikir və mülahizələrini bölüşüblər.

İclasda Ş. Əliyeva pedaqoji təcrübəyə hazırlıqla bağlı da ətraflı məlumat verib. Bildirib ki, bu tədris ilində fakültənin üç ixtisasından 12 qrup pedaqoji təcrübə keçəcək. Tələbələr Bakı şəhərinin 8 uşaq bağçasında, 4 orta məktəb, 3 xüsusi məktəb və 4 psixologiya və reablitasiya mərkəzlərində təcrübə keçəcəklər. Fakültənin pedaqoji təcrübəni həmişə yüksək səviyyədə həyata keçirdiyini, bu il də qarşıda duran vəzifələri tələb olunan səviyyədə yerinə yetirəcəklərini vurğulayıb.

İclasda professor Ramiz Əliyev, dosent Allahyar İmanov, professor Müseyib İlyasov, professor Ərəstun Baxşəliyev, dosent Zərifə Zeynalova, dosent Lamiyə Qurbanova, baş müəllim Münəvvər Məmmədova və digərləri çıxış ediblər.

Cari məsələdə proqram və metodik vəsaitlərin çap olunması müzakirə olunub və müvafiq qərarlar qəbul edilib.

# Fizika və texnologiya fakültəsinin Elmi Şurasının növbəti iclası

Fevralın 21-də Fizika və texnologiya fakültəsinin Elmi Şurasının növbəti iclası keçirilib. İclaların üzrə keyfiyyət və müvəffəqiyyət faizinin yüksəldiyini, "əlaçı" və "zərbəçi" tələbələrin sayı-



sın gündəliyinə payız semestrinin imtahan sessiyasının nəticələri haqqında hesabat, elmlər və fəlsəfə doktoru proqramı üzrə doktorantların attestasiyası, cari məsələlər daxil edilib.

İclasa başlamazdan əvvəl Elmi Şuranın üzvləri professor Edil Eyvazov, professor Vaqif Nəsirov, professor İsa İsmayılov fakültə Tələbə Elmi Cəmiyyətinin (TEC) keçirdiyi "Gələcəyə addım" I Elmi konfransının iştirakçılarına sertifikatları təqdim ediblər.

Payız semestrinin imtahan sessiyasının nəticələri haqqında fakültənin dekanı, Elmi Şuranın sədri, fizika üzrə fəlsəfə doktoru, dosent Arzu Daşdəmirov geniş və ətraflı məlumat verib. Dosent A.Daşdəmirov payız semestrinin imtahan sessiyasının nəticələrinin əvvəlki illərdən daha yaxşı olduğunu, "Fizika müəllimliyi" və "Texnologiya müəllimliyi" ixtisasının artdığını qeyd edib, hər iki ixtisas üçün bütün tədris illəri üzrə imtahanların nəticələrinin ətraflı təhlilini verib. Sessiya müddətində yaranan problemlərdən, onların aradan qaldırılmasından, ayrı-ayrı fənlər üzrə nəticələr haqqında, nəticələri yaxşı və pis olan imtahanlar haqqında ətraflı məlumat verib.

İkinci məsələ ilə bağlı Ümumi fizika kafedrasının "Molekulyar fizika" ixtisası üzrə doktorantı Güney Mirzəyeva 1 il ərzində gördüyü işlər haqqında məlumat verib. Onun hesabatı qənaətbəxş hesab edilib.

Cari məsələlərin müzakirəsi zamanı bəzi fənlər üzrə hazırlanmış proqramlar təsdiq edilib, 2017-2018-ci tədris ilinin payız semestrinin imtahan sessiyasının nəticələrinə əsasən tələbələrə təqaüdün təyin edilməsi haqqında qərar qəbul edilib.

# ADPU-nun Şamaxı Filialında Xocalı soyqırımının iyirmi altıncı ildönümünə həsr olunmuş silsilə tədbirlər

Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Şamaxı Filialında Xocalı soyqırımının iyirmi altıncı ildönümü ilə əlaqədar Tədbirlər planı hazırlanmış və həmin Tədbirlər planına uyğun olaraq filialda silsilə tədbirlər keçirilib. Fevralın 20-də filialın kitabxanasında soyqırımın dəhşətlərinin əks olunduğu guşə hazırlanıb. Fevralın 21-də Xocalı soyqırımı hadisələrini əks etdirən "Xoca" filmi nümayiş olunub.

Fevralın 22-də "Xocalı soyqırımı bəşəri cinayətdir" adlı tədbir keçirilib. Tədbir Qarabağ müharibəsində şəhid olmuş soydaşlarımızın xatirəsinin bir dəqiqəlik sükutla yad edilməsi ilə başlanıb.

Fevralın 23-də filialın Tələbə Gənclər Təşkilatının (TGT) və Tələbə Elmi Cəmiyyətinin (TEC) fəallarının iştirakı ilə Xocalı faciəsinə həsr olunmuş intellektual oyun keçirilib. Fevralın 26-da filialda ilk dərs saatı Xocalı soyqırımının tarixi faktlarına həsr olunub.

Həmin gün filialın rəhbərliyi başda olmaqla, müəllim və tələbələr Şamaxı şəhər ictimaiyyəti ilə birgə rayon mərkəzində yerləşən Soyqırımı abidəsini ziyarət etdilər və abidənin önünə tər qərənfillər düzülər. Tədbir Şamaxı Şəhər İncəsənət Təhsili Mərkəzində davam etdirilib. Xocalı faciəsinə həsr olunmuş həmin tədbirdə filialın tələbələri seir kompozisiyası və drammatik səhnəciklə o illərin faciəsini canlandırıblar. Tədbirin sonu qələbə ruhlu ifalarla başa çatıb.



Filialın həyətyanı sahəsində tələbələrin iştirak etdiyi "Xocalı" sözünün ingilis dilində (Khojaly) əks olunduğu flaşmob nümayiş etdirilib.

Tədbirlər planınna əsasən sonuncu tədbir müəyyən edilmiş münsiflər heyəti tərəfindən filialın TGT və TEC fəallarının təşkilatçılığı ilə təşkil olunmuş Xocalı faciəsini əks etdirən rəsm əsərlərinə baxışın keçirilərək qaliblərin müəyyənləşdirilməsi olub.

# Akademik Budaq Budaqovun 90 illik yubileyi ilə bağlı tədbir



Fevralın 22-də Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) AMEA-nın akademik Həsən Əliyev adına Coğrafiya İnstitutu, Azərbaycan Coğrafiya Cəmiyyəti (ACC) və ADPU-nun Tarix və coğrafiya fakültəsinin birgə təşkilatçılığı ilə böyük coğrafiyaçı alim, akademik Budaq Budaqovun 90 illik yubileyi ilə bağlı tədbir keçirilib. Tədbirdə fakültənin dekanı, dosent Şahin Pənahov, dekan müavini, ACC-in vitse-prezidenti, dosent Mətanət Əsgərova, AMEA-nın akademik Həsən Əliyev adına Coğrafiya İnstitutunun elmi işlər üzrə direktor müavini, dosent Məhərrəm Həsənov, institutun əməkdaşları Zakir Eminov, Habil Haqverdiyev, Müseyib Yunusov, o cümlədən xüsusi qonaq qismində ABŞ-ın Pensilvaniya ştatının Lihay Universitetinin əməkdaşı, coğrafiyaçı alim, professor Jill Sperandio, fakültənin professor-müəllimləri və tələbələri iştirak ediblər.

Tədbiri giriş sözü ilə açan dosent Mətanət Əsgərova Azərbaycan coğrafiya elminin korifeylərindən olan akademik Budaq Budaqovun yubiley tədbirinin məhz ADPU-nun Tarix və coğrafiya fakültəsində keçirilməsinin bir mənəvi borc və qürurverici hadisə olduğunu xüsusi vurğulayıb. Çünki Azərbaycan coğrafiya elminin patriarxlarından sayılan akademik Budaq Budaqov məhz ADPU-nun məzunu olub.

Fakültənin tələbələrindən ACC üzvləri olan C-201-ci qrup tələbəsi Taleh Mirzəyev "Budaq Budaqov fotolarda" adlı maraqlı təqdimatla çıxış edərək, böyük alimin həyat və fəaliyyətinin müxtəlif dövrlərini əks etdirən nadir fotolarını nümayiş etdirib, onlarla bağlı öz fikirlərini bölüşüb. C-105-ci qrup tələbəsi Tansu Bayramova alimin həyat və elmi fəaliyyəti ilə bağlı rus dilində məruzə ilə çıxış edib. C-301-ci qrup tələbələri Həyat Nəsirova, Aytək Rəhimli və C-302-ci qrup tələbəsi Nəzrin Məmmədzadə görkəmli elm xadiminin həyatı, elmi-tədqiqatları, əsərləri haqqında ingilis dilində genis təqdimatla çıxış ediblər.

Sonra çıxış edən AMEA-nın Həsən Əliyev adına Coğrafiya İnstitutunun elmi işlər üzrə direktor müavini, dosent Məhərrəm Həsənov akademik Budaq Budaqovla bağlı öz zəngin xatirələrini iştirakçılarla bölüşüb.

Qeyd edək ki, tədbirin təşkilində və həyata keçirilməsində yaxından iştirak etdiklərinə və ACC-in ADPU filialındakı fəal ictimai fəaliyyətlərinə görə tələbələrdən Kənan Bağırova, Röyalə Əzizliyə, Taleh Mirzəyevə, Həyat Nəsirovaya, Aysun Hacıbəyliyə, Aytək Rəhimliyə, Tansu Bayramovaya, Nəzrin Məmmədzadəyə və Elvin Vahidova diplomlar təqdim edilib.

Tədbirdə tələbələrin akademik Budaq Budaqovla bağlı hazırladıqları videoçarx nümayiş olunub.

Tədbirdə yekun sözü ilə çıxış edən fakültənin dekanı, dosent Şahin Pənahov akademikin bir tələbəsi, həmkarı kimi öz dəyərli xatirə və tövsiyələrini gənclərlə bölüşüb, qonaqlara və təşkilatçılara öz təşəkkürünü bildirib.

Sonda xatirə şəkili çəkdirilib.

# "Xocalını unutmayaq, unutdurmayaq!" adlı anım tədbiri

Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Quba Filialında Xocalı faciəsinin iyirmi altıncı ildönümü ilə əlaqədar silsilə tədbirlər keçirilib. Belə ki, əvvəlcə fevralın 22-də filialda "Xocalını unutmayaq, unutdurmayaq!" adlı anım tədbiri keçirilib. Tədbirdə filialın tərbiyə işləri üzrə direktor müavini Aysel Şeydayeva, dekan müavini Nübar Bayramova, filialın əməkdaşı, Respublika Qadınlar Cəmiyyətinin üzvü Nəhayət Şirinova, Tələbə Gənclər Təşkilatının (TGT) sədri Həcər Seyidəhmədova, TGT-nin sədr müavini Elvin Seyfəddinov, "Azərbaycan dili və ədəbiyyat müəllimliyi" ixtisasının I tədris ili tələbəsi Türkan Mərdanlı çıxış edib, Xocalı soyqırımı və bu soyqırımın dünyaya çatdırılması haqqında məlumat veriblər.

Sonda " Xoca " filmi nümayiş olunub.

Fevralın 23-də filialın tələbələrindən bir qrupu Quba Rayon Mərkəzi Kitabxanasında Xocalı faciəsinin iyirmi altıncı ildönümünə həsr edilən anım tədbirində iştirak ediblər. Fevralın 26-da filialın direktoru, professor Əli Allahverdiyev, müəllim və tələbə kollektivi ümumrayon tədbirində iştirak ediblər.

Fevralın 26-da Quba şəhər Şahdağ Otel-



də yazıçı Əlibala Məhərrəmzadənin "Xocalı soyqırımı" adlı kitabının təqdimatı keçirilib. Təqdimatda filialın dekan müavini Nübar Bayramova, Kitabxana müdiri Samirə Haciyeva, "İbtidai sinif müəllimliyi" ixtisasının II tədris ili tələbələri iştirak ediblər. Təqdimatda yazıçı Əlibala Məhərrəmzadə çıxış edib, Xocalı soyqırımının dəhşəti, ermənilərin soyqırımı və deportasiya siyasətindən ətraflı danışıb. Sonda iştirakçılara "Xocalı soyqırımı" kitabı paylanılıb.

# "Xocalı faciəsi xalqımızın qan yaddaşıdır" mövzusunda anım tədbiri

Fevralın 23-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Ağcabədi Filialında Xocalı soyqırımının iyirmi altıncı ildönümünə həsr olunmuş "Xocalı faciəsi xalqımızın qan yaddaşıdır" mövzusunda anım tədbiri keçirildi. Tədbirdə Ağcabədi Rayon İcra Hakimiyyətinin (RİH) İctimai-siyasi və humanitar məsələlər şöbəsi müdirinin müavini Təyyar Hacıyev iştirak edirdi. Tədbirdə əvvəlcə Xocalıda və bütövlükdə Qarabağ uğrunda gedən döyüşlərdə şəhid olmuş oğul və qızlarımızın əziz xatirəsi bir dəqiqəlik sükutla yad edildi.

Tədbiri giriş sözü ilə açan filialın direktoru, dosent Mətanət Fərzəliyeva Xocalı faciəsi haqqında məlumat verərək bildirdi ki, o dəhşətli gündən 26 il ötür. Erməni silahlı qüvvələri uzun sürən mühasirədən sonra 26 fevral 1992-ci ildə xaricdəki havadarlarının hərbi yardımı ilə Xocalı şəhərini yerlə-yeksan etdi. Köməksiz dinc mülki əhali amansızlıqla qətlə yetirildi. Hətta südəmər körpələrə, əlsiz-ayaqsız qocalara, qadınlara, uşaqlara belə aman verilmədi. Yüzlərlə adam əsir götürülərək dəhşətli işgəncələrə və görünməmiş təhqirlərə məruz qaldı. Azərbaycan xalqına qarşı yönəldilmiş Xocalı soyqırımı ağlasığmaz qəddarlığı və qeyri-insani cəza üsulları ilə tayı-bərabəri olmayan vəhşilik aktı kimi insanlığa qarşı tarixi bir cinayətdir.

Məruzəçi bu faciəni təkcə Azərbaycan xaqlının faciəsi deyil, bəşəriyyətin, insanlığın faciəsi adlandırdı.

Sonra söz filialın baş müəllimi Araz Əliyevə verildi. A.Əliyev Xocalının tarixi keçmişindən danışdı və bu torpaqların əcdadlarımızın orta tunc dövründə yaşayış məskəni olduğunu dəqiq faktlarla sübuta yetirdi. Çıxışçı Gülüstan və Türkmənçay sülh müqavilələrindən sonra Azərbaycan ərazisində yerləşdirilən ermənilərin zaman keçdikcə "Böyük Ermənistan" xülyası ilə yaşadıqlarını və bu yolda hər cür çirkin əməllərə imza atmalarını tarixi faktlar əsasında açıqladı. Ermənilərin bir-birinin ardınca törətdikləri qırğın və faciələrdən danışan A.Əliyev bildirdi ki, Xocalı faciəsi tarixən yaşanmış faciələrinin bir səhifəsi olmaqla, daha dəhşətli və ağlasığmazdır. Xocalıda əsir düşənlərin bir çoxunun aqibəti hələ də bilinmir və dünya birliyi bu ədalətsizliyə göz yumur. Biz yalnız o zaman mənəvi rahatlıq tapa bilərik ki, Vətənimizi erməni tapdağından təmizləyək və zəfər bayrağımızı Şuşada, Xankəndində və Xocalının səmasında dalğalandıraq. Buna görə də Azərbaycan Prezidenti, Ali Baş Komandan cənab İlham Əliyevin ətrafında sıx birləşməli və hər an döyüş əmrinə hazır olmalıyıq.



Dosent M.Fərzəliyeva qeyd etdi ki, bu günlər dünyanın bir çox ölkələrində Xocalının günahsız qurbanlarının əziz xatirəsi ehtiramla yad edilir. Xocalı soyqırımı qurbanlarının müqəddəs ruhu qarşısında bir daha baş əyib, Allahdan onlara rəhmət diləyir və əminliyimi bildirmək istəyirəm ki, Azərbaycan Respublikasının Prezidenti, Ali Baş Komandan cənab İlham Əliyevin rəhbərliyi ilə sülh yolu ilə beynəlxalq hüququn norma və prinsipləri əsasında tezliklə torpaqlarımızın düşmən tapdağından azad edilməsinə nail olacağıq və ərazi bütövlüyümüz bərpa ediləcəkdir. Azərbaycan xalqının qüdrəti və iradəsi ilə qarşımıza qoyduğumuz bütün ali məqsədlərə nail olacağıq.

"Xocalı faciəsi xalqımızın qan yaddaşıdır" mövzusunda məruzə edən filialın dosenti Yaqub Səmədov 26 fevral 1992-ci ildə baş vermiş qeyri-insani bir faciəni ən kiçik məqamlarına qədər tədbir iştirakçılarının nəzərinə çatdırdı. Qeyd etdi ki, ermənilərin Xocalıya qarşı hücum planı faciənin törədildiyi vaxtdan çox illər əvvəl hazırlanmışdı. Xocalı əvvəlcə iqtisadi, sonra isə hərbi blokadaya salınaraq tamamilə Yer üzündən silinməli idi.

Dosent Y.Səmədov bildirdi ki, vaxtilə Xocalıda dəhşətli qətliamı törədənlər bu gün yüksək vəzifələrdə çalışaraq dünya ictimaiyyəti qarşısına çıxırlar. Serj Sarkisyan və Seyran Ohanyan Xocalı soyqırımının iştirakçıları olaraq ədalət məhkəməsində ittiham olunmaq əvəzinə, yüksək tribunalarda öz iyrənc əməllərinə haqq qazandırmaqla məşğuldurlar.

Xocalı faciəsi öz mahiyyəti, miqyası etibarilə dünyada baş verən faciələrin daha dəhşətlisidir.

Tədbirdə filialın dosenti Məhəmməd Hüseynov, dosent əvəzi Tahir Kərimli, dosent əvəzi Sahib Zeynalov, baş müəllim Qələndər Xıdırov çıxış etdilər. Natiqlər öz çıxışlarında qeyd etdilər ki, Xocalı soyqırımı bəşəriyyətin faciəsi olmaq etibarilə yaddaşlardan heç vaxt silinməyəcək. Doğrudur, dünya dövlətləri hələ də bu faciəyə ikili standartlardan yanaşır. Lakin gün gələcək, bu faciənin dəhşətlərini hər bir millət yaxşı anlayacaq. Bu, sadəcə olaraq bir arzu, istək deyil. Dövlət başçımız cənab İlham Əliyevin apardığı məqsədyönlü siyasət, Birinci Vitse-prezident Mehriban xanım Əliyevanın, Heydər Əliyev Fondunun vitse-prezidenti Leyla xanım Əliyevanın Xocalı həqiqətlərinin dünyaya tanıdılması yönündə apardıqları əməli fəaliyyət bizi daha əminliklə danışmağa ruhlandırır.

Ağcabədi RİH-in İctimai-siyasi və humanitar məsələlər şöbəsi müdirinin müavini T. Hacıyev çıxışında tədbirin təşkili üçün filial rəhbərliyinə təşəkkürünü bildirdi və qeyd etdi ki, belə tədbirlərin təhsil müəssisələrində keçirilməsi daha məqsədəuyğundur. T.Hacıyev bildirdi ki, mənfur qonşularımız daim tariximizi məhv etməyə çalışmış, hazırda işğal etdikləri regionların tarixi abidələrini məhv etməklə məşğuldurlar. Lakin bu bizi ruhdan salmamalıdır. Bu gün Azərbaycan güclü ordusu, güclü iqtisadiyyatı olan ölkələr sırasındadır. İnanırıq ki, Ulu Öndərimizin layiqli varisi, ölkə Prezidenti cənab İlham Əliyevin apardığı uğurlu siyasət nəticəsində işğal altında olan torpaqlarımız azad ediləcəkdir.

Tədbirin sonunda Xocalı faciəsi ilə bağlı sənədli film nümayiş etdirildi.

## Allah rəhmət eləsin!

Azərbaycan Dövlət Pedaqoji Universitetinin kollektivi Tarix və coğrafiya fakültəsinin dekanı, dosent Şahin Pənahova, qardaşı **Mahir Pənahovun** vəfatından kədərləndiyini bildirir və dərin hüznlə başsağlığı verir.

Azərbaycan Dövlət Pedaqoji Universitetinin kollektivi Əməkdar elm xadimi, professor Süleyman Məmmədova, qardaşı **Vəli Məmmədovun** vəfatından kədərləndiyini bildirir və dərin hüznlə başsağlığı verir.

Azərbaycan Dövlət Pedaqoji Universitetinin kollektivi İnsan və heyvan fiziologiyası kafedrasının müəllimi Yeganə Heydərovaya, anası **Nazirə xanımın** vəfatından kədərləndiyini bildirir və dərin hüznlə başsağlığı verir.

Redaktor: Nigar ABBASOVA
Məsul katib: Mahirə MUSTAFAYEVA

ÜNVANIMIZ: Bakı, Ü. Hacıbəyli küçəsi, 68 ADPU, Tel.: 498-18-41

Məqalələrdəki faktlara görə redaksiya məsuliyyət daşımır

ADPU-nun web-portalı: adpu.edu.az
Fotolar Nurlan Səmədovundur
Şəhadətnamə № 191

Sifariş: 643
Sayı: 1500
Çapa imzalanıb: 28.02.2018-ci il

ADPU-nun İctimaiyyətlə əlaqələr və marketinq şöbəsində yığılıb, "Azərbaycan" Nəşriyyatında səhifələnib və ofset üsulu ilə çap edilib.